"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

*"İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır".*

**İlham Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**
*(Universitetin 100 illik yubileyinin qeyd edilməsi haqqında Sərəncamından)*






**XÜSUSİ BURAXILIŞ**

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur.

63

2021 / № 06 (1109)

# ADPU-NUN 100 İLLİK YUBİLEYİ MÜNASİBƏTİLƏ REKTOR, PROFESSOR CƏFƏR CƏFƏROVUN TƏBRİKİ

Hörmətli pedaqoqlar, universitetimizin əməkdaşları və ölkəmizin təhsil cəfakeşləri!

Əziz tələbə və məzunlarımız!

Bu gün bizim hamımızı müqəddəs dəyərlər ilə ülvi şəkildə birləşdirən zəngin ənənələrə malik təhsil və elm məbədi - Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyini qeyd etmək hər birimizdə böyük qürur hissi doğurur. Çoxsaylı kollektivimiz, eləcə də respublikamızın geniş pedaqoji ictimaiyyəti üçün əziz olan bu möhtəşəm bayram münasibətilə indiyədək həyat və fəaliyyətini ADPU ilə bağlamış professor-müəllim heyətini, əməkdaşlarımızı, tələbələrimizi və sədası vətənimizin müxtəlif guşələrindən, habelə dünyanın uzaq məkanlardan gələn doğma təhsil ocağının hər bir yetirməsini, ölkədəki bütün həmkarlarımızı səmimi qəlbdən təbrik edirəm!



100 il bundan əvvəl xalqımızın maarifpərvər ziyalılarının səyi ilə yaradılmış ilk ali pedaqoji təhsil müəssisəsi həm də ana dilində fəaliyyətə başlayan birinci ali məktəb kimi cəmi 6 nəfər tələbə ilə müəllim hazırlığı sahəsində ağır missiyanı üzərinə götürərək, bir əsrlik böyük və şərəfli yolun tamamında 160 mindən çox peşəkar mütəxəssis, o cümlədən yüzlərlə tanınmış alim, çoxlu ictimai və mədəniyyət xadimi, əmək və müharibə qəhrəmanı yetişdirən nüfuzlu universitetə çevrilmiş və adını tarixə yazdırmışdır. Burada görkəmli pedaqoqlar və alimlər çalışmış, ölkəmizin təhsil sisteminin və müxtəlif elm sahələrinin inkişafına sanballı töhfələri ilə yadda qalmışlar.

Son illərdə universitetimizdə ali pedaqoji təhsilin məzmunu, idarəetmə və infrastrukturun yeniləşdirilməsi ilə bağlı həyata keçirilən tədbirlər, daha sağlam və şəffaf mühitin yaradılması, keyfiyyətin yaxşılaşdırılmasına yönəlmiş ardıcıl addımlar qəbul imtahanlarında yüksək nəticə göstərən abituriyentlərin müəllimlik peşəsinə və ADPU-da təhsilə marağının artmasına ciddi stimul vermişdir. İldən-ilə universitetə və onun filiallarına yüksək balla daxil olan tələbələrin, MİQ imtahanlarında uğur qazanan məzunların sayı dinamik şəkildə çoxalır.

Məmnuniyyətlə qeyd etmək olar ki, ADPU-nun beynəlxalq əlaqələri də getdikcə genişlənmiş, Avropa və MDB ölkələrinin 53 tanınmış universiteti ilə əməkdaşlıq müqaviləsi bağlanmışdır. Bu sırada ABŞ-ın Corc Vaşinqton Universiteti ilə ikili diplom proqramı üzrə magistr hazırlığına dair saziş beynəlxalq təhsil təcrübəsinə malik kadrlar korpusunun formalaşdırılması baxımından xüsusi əhəmiyyət kəsb edir.

Universitetimizdə həm də bir çox xarici ölkələr üçün ixtisaslı mütəxəssislər yetişdirilir. Hazırda Türkiyə, Rusiya, Gürcüstan, Çin, Türkmənistan, Suriya və Ukraynadan olan 180-dən çox əcnəbi vətəndaş hazırlıq, bakalavriat və magistratura səviyyələrinin müxtəlif ixtisaslarında təhsil alır.

İnamla deyə bilərik ki, 100 yaşlı təhsil ocağımızın da xüsusi xidməti sayəsində həyata peşəkar mütəxəssis kimi vəsiqə qazanmış Azərbaycan müəllimi ona göstərilən etimadı doğrultmaq üçün səylə çalışır, savadlı və vətənpərvər nəsil yetişdirmək naminə böyük zəhmət sərf edir. Məktəblərdə bilik almaqla yanaşı, əxlaq, mənəviyyat, Vətənə dərin sevgi dərsi keçən gənclərimiz İkinci Qarabağ savaşı - Vətən müharibəsi imtahanından da başı dik, alnı açıq çıxdılar. Qəhrəmanlığın fəlsəfəsini dərindən mənimsəyənlər öz qanları və canları hesabına düşməni təslim aktını imzalamağa məcbur etdilər. Fəxr edirik ki, 44 günlük ağır döyüşlərdə Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Ermənistan ordusunu darmadağın edərək şanlı Zəfər salnaməsi yazan rəşadətli Silahlı Qüvvələrimizin sırasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin 178 tələbə və məzunu da var idi. ADPU ailəsinin ön cəbhədə qəhrəmanlıqla döyüşən 12 üzvü şəhidlik zirvəsinə yüksələrək, həyatlarının ən mühüm dərsinin öhdəsindən şərəf və ləyaqətlə gəldilər. Onların arasında savaşın yeganə xanım şəhidi olan Arəstə Baxışova da özünəlayiq uca yer tutur.

Əziz müəllimlər və həmkarlar!

Hörmətli təhsil ictimaiyyəti!

Nəcib müəllimlik peşəsinin yolçuları olan dəyərli tələbələrimiz!

Universitetin fəaliyyəti həmişə dövlətimizin diqqət mərkəzində olmuşdur. Xüsusilə xalqımızın ümummilli lideri Heydər Əliyev Pedaqoji Universitetə daim böyük qayğı göstərmiş, 5 dəfə bizim ali məktəbi ziyarət edərək onun işi ilə maraqlanmış, qiymətli tövsiyələrini vermiş və professor-müəllim heyətini dövlət təltifləri ilə mükafatlandırmışdır.

Cari ilin 17 aprel tarixində isə Prezident İlham Əliyev "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncam imzalamışdır. Sərəncamda ADPU-nun ölkənin təhsil sisteminin inkişafındakı mühüm rolu vurğulanaraq qeyd olunur: "İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır".

Cənab Prezidentin bu fikirləri son illər sürətli inkişaf yolunda inamla irəliləyən ölkəmizin ən geniş şəbəkələşməyə malik ali təhsil müəssisələrindən olan Pedaqoji Universitet ailəsinin fəaliyyətinə verilən ən ali qiymətdir. Bununla belə, təbii ki, həyat yerində durmur. Dünənki uğurlarımız gələcəyə atılan addımlarımızın möhkəm təməli, bugünkü nəticələrimiz sabahkı yol xəritəmizin kontur cizgiləridir. İndi ərazi bütövlüyünü bərpa etmiş Azərbaycan Respublikası inkişafının yeni mərhələsinə qədəm qoymuşdur. Bu isə bizim də qarşımızda daha məsul vəzifələr irəli sürür. Rəqabətədavamlı insan kapitalının formalaşdırılmasında müasir təhsil-tərbiyə texnologiyasına əsaslanmaqla yeni düşüncəyə, əxlaqi və mənəvi saflığa, yüksək peşə və ixtisas bacarıqlarına malik müəllim kadrlarının hazırlığı, onların vətənpərvər və dövlətçiliyə sədaqət ruhunda tərbiyəsi Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim kollektivinin əsas hədəfidir. Bu sahədə hamımız, o cümlədən ölkədə fəaliyyəti təhsilə bağlı olan, ürəyi məktəblə döyünən alimlər, pedaqoqlar, ekspertlər, bir sözlə, geniş maarifçilər ordusu əl-ələ verib yorulmadan birgə işləməliyik. İşğala son qoymuş azad Azərbaycanın azad uşaqlarından yeni yüzilliyin Yusif Məmmədəliyevlərini, Heydər Hüseynovlarını, Zahid Xəlilovlarını, Mehdi Mehdizadələrini, Səməd Vurğunlarını, Məmməd Arazlarını yetişdirmək diləyi ilə hər birinizi bir daha ürəkdən təbrik edir, bu müqəddəs və şərəfli yolda böyük uğurlar arzulayıram.

Bayramımız mübarək!

# 100 YAŞLI ELM VƏ TƏHSİL MƏBƏDİ

*Mən yer üzündə müəllimdən yüksək ad tanımıram!*
*Heydər Əliyev,*
*ümummilli lider*



**Yüz il əvvəldən bu günə**

Bu il ölkəmizin ən qocaman ali təhsil ocaqlarından biri olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin yaradılmasının 100-cü ildönümü tamam olur. Azərbaycan ziyalılarının milli təəssübkeşliyi, əzmkarlığı və fədakarlığı sayəsində yaradılmış universitet çətin, mürəkkəb və şərəfli bir yol keçmiş, milli düşüncənin inkişafına, pedaqoji və elmi-pedaqoji kadrların hazırlığına əvəzsiz töhfələr verən şöhrətli təhsil və elm müəssisəsinə çevrilmişdir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2021-ci il aprelin 17-də "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamı bir əsr ərzində əldə olunmuş nailiyyətlərə verilmiş ən yüksək qiymətdir. Sərəncamda universitetin ölkəmizin inkişafındakı xüsusi rolu vurğulanaraq qeyd olunur: "İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır".

Zəngin ənənəyə malik ali təhsil ocağı 1921-ci ilin 26 avqustunda Azərbaycan Xalq Komissarları Sovetinin sədri Nəriman Nərimanovun imzaladığı dekret əsasında cəmi 8 müəllim və 6 tələbə ilə fəaliyyətə başlamışdır. Dekretdə deyilirdi: "Respublikanın vahid əmək məktəbinin ideyalarını həyata tətbiq etməyə qabil yüksək ixtisaslı maarif işçiləri hazırlamaq məqsədilə bu ilin sentyabr ayının 1-dən etibarən Bakı şəhərində II dərəcəli şura məktəbləri üçün türk dilində müəllimlər hazırlaya biləcək Azərbaycan Dövlət Pedaqoji Kişi İnstitutu təsis edilsin".

Dekretin imzalanmasından xeyli əvvəl Pedaqoji İnstitutun təşkili ilə bağlı müəyyən hazırlıq işləri aparılmış, bu məqsədlə hələ 1920-ci ilin sonunda xüsusi komissiya yaradılmışdı. N.Nərimanov komissiya üzvlərini qəbul edən zaman öz razılığını bildirərək demişdi: "Mən görürəm, maarifin haradan başlanmasını ruhən düzgün düşünmüş və Azərbaycan xalqının nicatı yolunu görüb bütün həyatınızı ona həsr etmişsiniz. Azərbaycan Respublikası bu zəhmətinizi hər zaman təqdir edəcək. Azərbaycan xalqı həmişə sizi yad edəcəkdir".

Böyük elmi-pedaqoji kollektivə və çoxminli tələbə kontingentinə sahib olan Azərbaycan Dövlət Pedaqoji Universitetinə çevrilənədək bu təhsil müəssisəsi uzun bir yol qət etmiş, son 100 il ərzində 160 mindən çox yüksək ixtisaslı müəllim kadrları yetişdirməklə ölkəmizin sosial-mədəni inkişafında mühüm rol oynamışdır. Pedaqogika, psixologiya və ayrı-ayrı fənlərin tədrisi metodikası məhz bu ali məktəbdə təşəkkül tapmışdır. Eyni zamanda, bir əsrlik fəaliyyəti dövründə Pedaqoji Universitet yalnız Azərbaycan üçün deyil, Gürcüstan, Mərkəzi Asiya respublikaları, Bolqarıstan və digər ölkələr üçün də yüksək səviyyəli müəllim və elmi kadr hazırlığı işini uğurla həyata keçirmişdir.

Pedaqoji Universitet Azərbaycanda elm və təhsilin inkişafına sanballı töhfələr verən tanınmış alimlər yetişdirmiş, paralel olaraq, həm də elmi mərkəz kimi formalaşıb inkişaf etmişdir. Xalqımızın fəxr etdiyi yüzlərlə görkəmli alim, yaradıcı ziyalı, ictimai və dövlət xadimi bu universitetdə təhsil almışdır. Universitetin məşhur məzunları sırasında Məmməd Arif Dadaşzadə, Həmid Araslı, Mehdi Mehdizadə, Budaq Budaqov, Mikayıl Müşfiq, Süleyman Rəhimov, Mehdi Hüseyn, Şıxəli Qurbanov, İsmayıl Şıxlı, İlyas Əfəndiyev və bir məqalədə adını çəkə bilmədiyimiz onlarla digər ziyalını göstərmək olar. Böyük fəxrlə deyə bilərik ki, Azərbaycan Milli Elmlər Akademiyasının 11 prezidentindən üçü - Yusif Məmmədəliyev (2 dəfə), Zahid Xəlilov və Həsən Abdullayev, 5 vitse-prezidenti - Heydər Hüseynov, Səməd Vurğun, Zahid Xəlilov, Əlisöhbət Sumbatzadə və İsa Həbibbəyli məhz bizim universitetin məzunlarıdır. Sovet İttifaqı Qəhrəmanları Mehdi Hüseynzadə, Xıdır Mustafayev, Fariz Səfərov, Səlahəddin Kazımov, Sosialist Əməyi Qəhrəmanları Səfa İmanov, Zərbəli Səmədov, Rüstəm Səfərəliyev, Vətənin ərazi bütövlüyü uğrunda mənfur düşmənlə mübarizə aparmış Azərbaycanın Milli Qəhrəmanları Mirələkbər İbrahimov, Mətləb Quliyev, Şakir Salahov, "Zəfər" ordenli general-polkovnik Əli Nağıyev, "Azərbaycan Bayrağı" ordenli Malik Bayramov, Mürşid Məmmədov, böyük qələbə çaldığımız 44 günlük Vətən müharibəsində torpaqlarımızın mənfur düşməndən azad olunması yolunda canlarından keçmiş şəhidlərimizdən 12 nəfəri - Ağaqardaş Abbasov, İlkin Ağaquliyev, Elgün Əzizov, Ehtiram Hüseynli, Rəvan Lətifov, Cilingir Nəbiyev, Orxan Nəbiyev, Ceyhun Nüsrətli, Qoşqar Ömərov, Firdovsi Tahirov, Elvin Zakirov və yeganə xanım şəhidimiz Ərəstə Baxışova müxtəlif illərdə ADPU-nu bitirmişlər. Pedaqoji Universitet ölkədə pedaqoji və elmi-pedaqoji kadrların hazırlığını, təkmilləşdirilməsini və ixtisasının artırılmasını həyata keçirən pedaqoji təhsil müəssisələrinin böyük əksəriyyətinin yaradılmasında ilkin baza rolunu oynamış, onların sonrakı inkişafına yaxından dəstək göstərmişdir. Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutu (indiki Təhsil İnstitutu), 30-40-cı illərdə fəaliyyət göstərən ikiillik müəllimlər institutları, indiki Gəncə Dövlət Universiteti, Azərbaycan Dillər Universiteti və Bakı Slavyan Universiteti ya Pedaqoji İnstitutun ayrı-ayrı fakültələrinin bazasında yaradılmış, ya da institutun pedaqoji kadrlarının köməyi ilə fəaliyyətə başlamışdır. Azərbaycan Pedaqoji İnstitutunun Naxçıvan filialının (1967-1972) əsasında Y.Məmmədəliyev adına Naxçıvan Pedaqoji İnstitutu, onun bazasında isə sonralar Naxçıvan Dövlət Universiteti formalaşmışdır. 1967-ci ildə 3 ixtisas üzrə 102 tələbə və 3 müəllimlə fəaliyyətə başlayan indiki Naxçıvan Dövlət Universitetində hazırda 6 minə yaxın tələbə təhsil alır.

1969-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun filialı kimi fəaliyyətə başlayan Xankəndi Pedaqoji İnstitutu 1973-cü ildə müstəqil ali məktəbə çevrilmiş və 16 may 1988-ci ilə kimi fəaliyyət göstərmişdir. 1988-ci ildə erməni millətçiləri tərəfindən Xankəndidən qovulan institutun Azərbaycan bölməsinin müəllim və tələbələri bir müddət Gəncə Pedaqoji İnstitutunda yerləşmiş, sonra isə Şuşaya qayıtmışlar. Pedaqoji İnstitutun Şuşa fakültəsi, onun əsasında isə Şuşa filialı yaradılmışdır. Həmin filial hazırda Ağcabədi filialı kimi ADPU-nun nəzdində fəaliyyət göstərir.

Ümumiyyətlə, bu gün elə bir təhsil müəssisəsi (məktəbəqədər, ümumtəhsil, texniki-peşə, orta ixtisas, ali), elmi idarə, təşkilat və ya təhsillə bağlı QHT yoxdur ki, orada Pedaqoji Universitetin məzunları çalışmasın. Məzunlarımız həm də ayrı-ayrı dövlət orqanlarında, nazirlik, komitə və agentliklərdə, güc strukturlarında, özəl qurumlarda uğurla fəaliyyət göstərirlər.

**Universitetə dövlət qayğısı**

Azərbaycan Dövlət Pedaqoji Universiteti fəaliyyətinin əksər mərhələlərində, xüsusən də ulu öndər Heydər Əliyevin ölkəyə rəhbərlik etdiyi illərdə dövlətin müstəsna diqqət və qayğısı ilə əhatə olunmuşdur. Ulu öndərin ayrı-ayrı vaxtlarda 5 dəfə (1971, 1973, 1977, 1981, 1982) universitetə gəlişi professor-müəllim heyətinin daha səmərəli və məhsuldar işləməsi üçün əvəzolunmaz stimul yaratmışdır. Heydər Əliyev ilk dəfə 1971-ci ildə Pedaqoji İnstitutun partiya təşkilatının hesabat-seçki konfransında,

# 100 YAŞLI ELM VƏ TƏHSİL MƏBƏDİ

**Azərbaycan Dövlət Pedaqoji Universiteti fəaliyyətinin əksər mərhələlərində, xüsusən də ulu öndər Heydər Əliyevin ölkəyə rəhbərlik etdiyi illərdə dövlətin müstəsna diqqət və qayğısı ilə əhatə olunmuşdur. Ulu öndərin ayrı-ayrı vaxtlarda 5 dəfə (1971, 1973, 1977, 1981, 1982) universitetə gəlişi professor-müəllim heyətinin daha səmərəli və məhsuldar işləməsi üçün əvəzolunmaz stimul yaratmışdır.**

**Son illər Pedaqoji Universitet Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müstəsna diqqət və qayğısı sayəsində dinamik inkişaf yoluna qədəm qoymuşdur. Cənab Prezidentin 26 dekabr 2006-cı il tarixli Sərəncamı ilə ADPU-nun 85 illik, 18 aprel 2012-ci il tarixli Sərəncamı ilə 90 illik yubileyləri qeyd edilmişdir.**

1973-cü ildə institutun 50 illik, 1981-ci ildə isə 60 illik yubileylərində iştirak etmiş, yüksək dövlət mükafatlarını kollektivə təqdim edərək müəllim kadrları hazırlığının vəziyyəti və perspektivləri barədə geniş nitq söyləmişdir. O, 2 dəfə (1977 və 1982) Pedaqoji İnstitutda qəbul imtahanı prosesini izləmiş, ali məktəbin əməkdaşları və abituriyentlərin valideynləri ilə səmimi görüşlər keçirmişdir. Ulu öndərin Pedaqoji İnstitutun 50 illik yubileyində dediyi "Azərbaycan Dövlət Pedaqoji İnstitutu böyük və çətin yol keçmişdir. Onun kollektivi Azərbaycan ümumtəhsil məktəbinin inkişafında böyük xidmət göstərmiş, institut xalq maarifi üçün yüksək ixtisaslı kadrlar ocağına çevrilmişdir" sözləri professor-müəllim heyətinin fəaliyyətinə yeni stimul vermiş, institutun inkişaf strategiyasının hazırlanmasında və həyata keçirilməsində mühüm rol oynamışdır.

Pedaqoji İnstitutun kollektivinə daim xüsusi diqqət göstərən Heydər Əliyev 14 avqust 1978-ci ildə Bolqarıstan Xalq Respublikasında əmək semestrində (tələbə inşaat dəstəsində) iştirak edən institutun bir qrup tələbəsi ilə Sofiya şəhərində görüşmüş, gənclərə əmək və təhsildə müvəffəqiyyətlər arzulamışdır.

Son illər Pedaqoji Universitet Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müstəsna diqqət və qayğısı sayəsində dinamik inkişaf yoluna qədəm qoymuşdur. Cənab Prezidentin 26 dekabr 2006-cı il tarixli Sərəncamı ilə ADPU-nun 85 illik, 18 aprel 2012-ci il tarixli Sərəncamı ilə 90 illik yubileyləri qeyd edilmişdir. Elmin və təhsilin inkişafındakı xidmətlərinə görə universitet əməkdaşlarından 4-ü "Şöhrət" ordeni, 1-i 3-cü dərəcəli "Vətənə xidmətə görə" ordeni, 29-u "Tərəqqi" medalı ilə təltif olunmuş, 42-si "Əməkdar müəllim", 6-sı "Əməkdar elm xadimi", 5-i "Əməkdar jurnalist", 3-ü "Əməkdar mədəniyyət işçisi", 2-si "Əməkdar rəssam", 1-i "Əməkdar mühəndis", 1-i "Əməkdar bədən tərbiyəsi və idman xadimi" fəxri adlarına layiq görülmüş, 3 nəfərə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdləri verilmişdir.

Cənab İlham Əliyevin Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında Sərəncamı 20 min nəfərdən çox üzvü olan böyük ADPU ailəsinə böyük sevinc bəxş etmiş, bütün kollektivi daha səmərəli fəaliyyətə ruhlandırmışdır. Müəllim və tələbələrimiz yuxarıda qeyd edilən sərəncamları Pedaqoji Universitetin fəaliyyətinə dövlətimizin xüsusi diqqət və qayğısının təzahürü kimi dəyərləndirərək cənab Prezidentə dərin hörmət və minnətdarlıqlarını bildirirlər.

**İnkişaf edən dövlətin yenilənən ali təhsil müəssisəsi**

Son illər ölkəmizdə aparılan ardıcıl və məqsədyönlü islahatlar təhsilin bütün pillə və səviyyələrində yeni dövrün tələblərinə uyğun məzmun və bazanın formalaşdırılması, yaradıcı təfəkkürə və vətənpərvərlik ruhuna malik olan praktik səriştəli vətəndaşların yetişdirilməsi kimi ali hədəflərə yönəlmişdir. Nisbətən qısa zaman kəsiyində bu istiqamətdə nəzərəçarpacaq dəyişikliklər baş vermiş, müəyyən nailiyyətlər əldə edilmişdir. Respublikamızın orta ümumtəhsil müəssisələrində kurikulum sisteminin tətbiqi, müəllimlərin elektron müsabiqə yolu ilə işə qəbulu, onların bilik və bacarıqlarının müxtəlif səviyyələrdə monitorinqi və qiymətləndirilməsi, şagirdlərin məktəbə elektron qaydada qəbulu kimi innovativ yanaşmalar artıq öz müsbət nəticələrini verməkdədir.

Son 18 ildə təhsilin maddi-texniki bazasının təkmilləşdirilməsi məqsədilə istər dövlət, istərsə də Heydər Əliyev Fondu tərəfindən ən yüksək standartlara cavab verən minlərlə yeni məktəb binası inşa olunmuş, universitet və institutların texniki təchizatı yaxşılaşdırılmış, İKT-nin tətbiqinin genişləndirilməsi üzrə dövlət proqramları hazırlanaraq icra edilmişdir. Ötən ildən dünyanı cənginə alan qlobal koronavirus pandemiyası fonunda bütün təhsil sisteminin distant tədrisə keçməsi ilə əlaqədar ən qısa zamanda əhatəli virtual təhsil platformasının yaradılması isə dövlətimizin və onun müvafiq qurumlarının bu sahədə nə qədər çevik və səriştəli olduqlarını bir daha nümayiş etdirmişdir.

Təhsilin bütün pillələrinin inkişafı ilə bağlı hüquqi bazanın yenilənməsi və təkmilləşdirilməsi istiqamətində də ardıcıl və nəticəyönümlü tədbirlər həyata keçirilir. İlin əvvəlində dövlət başçısı tərəfindən təsdiq olunmuş "Azərbaycan-2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" adlı strateji inkişaf sənədində XXI əsrin tələblərinə uyğun təhsil sisteminin formalaşdırılması dayanıqlı dövlətin əsas hədəflərindən biri kimi öz əksini tapmışdır.

Sözsüz ki, bütün bu islahatlar ali təhsildən, xüsusən də orta ümumtəhsil sisteminə birbaşa təsir edən pedaqoji ali təhsildən yan keçə bilməz. Bu baxımdan, ölkəmizin əsas pedaqoji ali təhsil müəssisəsi olan ADPU-da da bütün sahə və istiqamətlər üzrə sürətli inkişaf və yenilənmə prosesləri gedir.

Bu gün Bakıdakı 4 tədris korpusu, Quba, Şamaxı, Şəki, Ağcabədi və Cəlilabaddakı filialları, tərkibindəki Azərbaycan Dövlət Pedaqoji Kolleci və Bakı şəhərindəki baza məktəbi ilə ölkənin ən böyük və şəbəkələşmiş ali təhsil müəssisələrindən olan Pedaqoji Universitet, orta məktəblərin tədris proqramlarına daxil olan bütün fənlər üzrə bakalavriat səviyyəsində peşəkar və zəruri bacarıqlara malik müəllimlər yetişdirir. Universitetdə ümumilikdə 18000-dən artıq tələbənin təlimi ilə 2000-dək əməkdaş məşğul olur ki, onların da arasında 70-dən çox elmlər doktoru, professor, yüzlərlə dosent və fəlsəfə doktoru vardır.

Mübaliğəsiz demək olar ki, son illərdə Pedaqoji Universitet keyfiyyətcə yeni inkişaf mərhələsinə qədəm qoyub. Ali təhsil müəssisəsində həm maddi-texniki baza, həm tədris, həm sosial həyat, həm də elmi fəaliyyət uğurla inkişaf etməkdədir. Dövlət siyasətinin prioritetlərinə uyğun olaraq, bu gün professor-müəllim və tədris-yardımçı heyətin gəncləşdirilməsi prosesi gedir, universitetin məzunları davamlı olaraq doğma təhsil ocağında işə cəlb edilirlər.

Universitetdə imtahanların test üsulundan yazılı formaya keçirilməsi isə sözün əsl mənasında təhsilin keyfiyyətinə öz müsbət təsirini göstərmişdir. Bu minvalla ölkədə müəllim hazırlığı prosesinə yeni sistem gətirilmiş və həmin sistem nisbətən qısa zaman kəsiyində özünü tam doğrulda bilmişdir. Nəticədə məzunlarımızın müəllimlərin işə qəbulu (MİQ) imtahanlarındakı nəticələri son illər təxminən 4 dəfə yüksəlmişdir. Həyata keçirilən tədbirlər, təhsil ocağında imtahan sisteminin daha da şəffaflaşdırılması, tələbə-rəhbərlik münasibətlərinin sadələşdirilməsi və demokratikləşdirilməsi inkişafa sanballı töhfə verən amillərdəndir.

Adlı təqaüdlərin təsis edilməsi, həmçinin tələbələrin digər həvəsləndirici tədbirlərə cəlb olunması, universitet və fakültə rəhbərlərinin onlarla müntəzəm (o cümlədən onlayn) görüşlər keçirməsi təhsilalanlarda tədrisə olan marağı daha da artırır. Razılıq hissilə qeyd etmək olar ki, hazırda universitet tələbələrinin 70 faizə qədəri təqaüd alır. Dövlət təhsil siyasətinin tələblərinə uyğun olaraq, yaxın gələcəkdə bu nisbəti daha da artırmaq istiqamətində işlər aparılır.

Universitetdə tələbələrin maraq dairəsinə uyğun fəaliyyətlərin genişləndirilməsi, onların sosial və digər problemlərinin həllinə dəstək göstərilməsi Pedaqoji Universiteti gənclərimiz üçün səmimi təhsil mühiti yaradılmış məkan kimi daha da cəlbedici edir.

Son 5 ildə ADPU-da müəllimlərin şəffaf seçki sisteminin tətbiqi və təkmilləşdirilməsi yönündə aparılan ardıcıl və məqsədyönlü işlər, demək olar ki, artıq başa çatdırılıb. Hazırda yalnız fakültə dekanları və kafedra müdirləri yox, müəllim və tyutorlar da müsabiqə yolu ilə vəzifəyə seçilirlər.

Universitetdə tyutor hazırlığı kursları fəaliyyət göstərir. Bütün bu islahatlar tək Bakıda deyil, ADPU-nun bütün filiallarında və nəzdindəki kollecdə də mütəmadi olaraq davam etdirilir. Universitetin beynəlxalq əməkdaşlığı ildən-ilə genişlənməkdədir. Mübadilə

# 100 YAŞLI ELM Və TəHSİL MəBəDİ

proqramları çərçivəsində bir çox ölkələrə tələbə və müəllimlərin göndərilməsi prosesi davam edir. Hazırda ADPU-nun 53 xarici ali təhsil müəssisəsi ilə birbaşa əlaqələri mövcuddur. Türkiyənin 11 universiteti ilə "Mövlanə" proqramı çərçivəsində əməkdaşlıq edilir. Erasmus+ mübadilə proqramı çərçivəsində Erasmus+ tərəfdaş universitetləri arasında tələbə, akademik və inzibati heyətin mübadiləsi mütəmadi olaraq həyata keçirilir. Pedaqoji Universitet Avrasiya Universitetlər Birliyi (EURAS), Kafkasya Universitetlər Birliyi (KÜNİB) kimi beynəlxalq assosiasiyalarla yaxından əməkdaşlıq edir. ADPU həmçinin Avropa Müəllim Hazırlığı Şəbəkəsi (ETEN) və Universitet Prezidentlərinin Beynəlxalq Assosiasiyasının (İAUP) üzvüdür.







- Zəfər sevincini yaşayan Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim və tələbə heyəti universitetin 100 illik yubileyinin keçirilməsinə xüsusi diqqət göstərən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə və Birinci vitse-prezident Mehriban xanım Əliyevaya dərin hörmət və minnətdarlığını bildirir.
- Böyük elmi-pedaqoji kollektivə və çoxminli tələbə kontingentinə sahib olan Azərbaycan Dövlət Pedaqoji Universitetinə çevrilənədək bu təhsil müəssisəsi uzun bir yol qət etmiş, son 100 il ərzində 160 mindən çox yüksəkixtisaslı müəllim kadrları yetişdirməklə ölkəmizin sosial-mədəni inkişafında mühüm rol oynamışdır.
- Universitetin beynəlxalq əməkdaşlığı ildən-ilə genişlənməkdədir. Mübadilə proqramları çərçivəsində bir çox ölkələrə tələbə və müəllimlərin göndərilməsi prosesi davam edir. Hazırda ADPU-nun 53 xarici ali təhsil müəssisəsi ilə birbaşa əlaqələri mövcuddur. Türkiyənin 11 universiteti ilə "Mövlanə" proqramı çərçivəsində əməkdaşlıq edilir.

**Pedaqoji Universitet bu gün**

Şəffaflıq, keyfiyyət və tələbə məmnuniyyətini hədəfləyən kompleks tədbirlər nəticəsində Pedaqoji Universitetin əldə etdiyi uğurları və tətbiq olunan yenilikləri qısaca nəzərdən keçirməklə inkişaf dinamikasını izləmək mümkündür.

ADPU-nun 2018-2021-ci illər üçün "Ənənələrə sadiq, yeniliklərə açıq universitet!" şüarı ilə Strateji İnkişaf Planı qəbul olunub və onun icrası artıq tamamlanmaq üzrədir.

Tələbə biliyinin qiymətləndirilməsində test sistemindən yazılı imtahanlara keçid, professor-müəllim heyətinin seçkisinin və işçilərin işə qəbulunun müsabiqə üsulu ilə aparılması nəticəsində tədrisin keyfiyyəti nəzərəçarpacaq dərəcədə yüksəlib.

Keçmiş Azərbaycan Müəllimlər İnstitutu ilə birləşmədən sonra işçi heyətinin sayında və universitetin strukturunda optimallaşdırmanın aparılması, fakültə və kafedraların idarəetmə sisteminin təkmilləşdirilməsi, onlardan bəzilərinin birləşdirilməsi, ixtisasların, təhsil səviyyələri üzrə fənlərin fakültə və kafedralar arasında dəqiq bölgüsü, TÜRKSOY kafedrasının, YUNESKO klubunun yaradılması və s. kimi tədbirlərlə müsbət dinamika əldə olunub (hazırda həmçinin YUNESKO kafedrasının yaradılması ilə bağlı layihə hazırlanır).

ADPU-nun həm də elmi mərkəzə çevrilməsinə yönələn tədbirlər fonunda son illər hazırlanmış 6 elmi tədqiqat layihəsi Elm Fondu tərəfindən dəstəklənmiş, universitetdə Elmi-Tədqiqat Mərkəzi yaradılmış, 6 dövri elmi jurnal təsis edilmiş və onlar Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyası tərəfindən "Azərbaycan Respublikasında dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən dövri elmi nəşrlər siyahısı"na daxil edilmişdir. Magistrantların elmi-tədqiqat işlərinin dərc edilməsi məqsədilə Azərbaycanda ilk dəfə "Magistrant" dövri elmi jurnalı təsis edilmiş və ilk nömrəsi işıq üzü görmüşdür. Universitetin elmi plagiatla mübarizə üzrə daxili sistemi qurulmuşdur. Əməkdaşların beynəlxalq istinadlı jurnallarda çap olunmuş əsərlərinin sayı son 5 ildə dəfələrlə artmışdır. Bu nəticələr "Clarivate Analytics" elmi bazası tərəfindən də qiymətləndirilmiş, ADPU mükafatlandırılmışdır.

Pedaqoji Universitetdə professor-müəllim heyətinin fəaliyyət göstəricilərinin qiymətləndirilməsi üçün işlək mexanizm (reytinq sistemi) yaradılıb. Sistemin tətbiq olunduğu ilk ildə ayda 100, son ildə isə 150 ən yüksək nəticə əldə edən müəllimə əlavə ödənişlərin edilməsinə başlanılıb, keyfiyyət təminatı şöbəsi yaradılıb.

2020-ci ildə universitetin mütəxəssisləri tərəfindən bütün müəllimlik ixtisasları üzrə yeni nəsil təhsil proqramları hazırlanıb və Təhsil Nazirliyi tərəfindən təsdiq edilib. Bu proqramlarda müəllim hazırlığı sahəsində bir sıra digər yeniliklərlə yanaşı, pedaqoji internaturanın təşkili də nəzərdə tutulur.

ADPU-nun SABAH qruplarında 4 ixtisas üzrə tələbələr təhsil alır. Universitetdə cari tədris ilindən bəzi ixtisaslar üzrə ingilis bölməsi yaradılıb. İlk dəfə olaraq magistratura səviyyəsində təhsil üzrə MBA (Təhsilin təşkili və idarə edilməsi), Təlim və tədrisin təşkili və metodikası üzrə SABAH magistratura və Gənclərlə iş ixtisaslaşmaları üzrə mütəxəssis hazırlığına başlanılır. Fizika, texnologiya, riyaziyyat, informatika, kimya və biologiya müəllimliyi ixtisaslarında STEAM bacarıqları olan yeni nəsil müəllimlərin hazırlanması yönündə işlər aparılır. ADPU-da STEAM laboratoriyası yaradılıb, seçilmiş professor-müəllim heyətinə Təhsil İnstitutu ilə birlikdə müvafiq təlimlər keçirilib və yeni tədris ilindən yuxarıda qeyd olunan ixtisasların tələbələrinə "STEAM" fənni tədris ediləcəkdir. Həmçinin inklüziv təhsil yanaşmasının geniş tətbiqinə və müvafiq ixtisaslarda inklüziv təhsil fənninin tədrisinə başlanılır.

Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramına uyğun olaraq, yuxarıda qeyd edildiyi kimi, iki ildir ABŞ-ın Corc Vaşinqton Universiteti ilə birgə magistratura səviyyəsində "Təhsil idarəçiliyi" üzrə beynəlxalq ikili diplom proqramı həyata keçirilir və 50 gənc bu proqramda təhsil alır.

Hazırda ölkənin ikinci ən böyük universitet kitabxanasına malik olan ali təhsil ocağı BP şirkəti ilə birgə kitabxana fondunun elektronlaşdırılmasını nəzərdə tutan irimiqyaslı layihə yekunlaşmaq üzrədir.

**Yeni yüzilliyə daxil olarkən**

Bu gün 100 yaşı tamam olan Pedaqoji Universitet fəaliyyətinin növbəti yüzilliyinə yeni və daha çevik hədəflərlə daxil olur. Necə deyərlər, yubiley, əslində, geriyə baxmaq, görülən işlərə nəzər salıb gələcəyi müəyyənləşdirmək üçün düşünmə imkanıdır. XXI əsrdə - dünyada elm, təhsil və texnologiyaların misli görünməmiş sürətlə inkişaf etdiyi bir şəraitdə Pedaqoji Universitet yüksək ixtisaslı, müasir dünyagörüşlü, milli dəyərlərə sadiq müəllim kadrlarının hazırlanmasını təmin etmək üçün aşağıda sadalanacaq vəzifələrin yerinə yetirilməsini strateji xətt kimi müəyyənləşdirib. 100 illik yubileydən sonra universitetin 2030-cu ilə hədəflənən yeni strateji inkişaf planında da bu istiqamətlər nəzərə alınacaqdır. Həmin istiqamətlər, əsasən, aşağıdakıları ehtiva edir:

**Təhsilalanlara Vətən, dövlət və tarix sevgisinin aşılanması:**

Gənc müəllimlər Azərbaycan Respublikasının fəal vətəndaşları kimi Vətənə və müstəqil dövlətimizə bağlı, milli-mənəvi və əxlaqi dəyərlərə sadiq insanlar kimi formalaşdırılmalıdırlar. Onların öz xalqına olan sevgisi valideynlərə sevgidən, torpağa sevgisi böyüdüyü məhəlləyə sevgidən başlayaraq milli-mənəvi sərhədlərimizədək uzanmalıdır.

**Təhsilalanların öz ölkəsinin tərəqqisinə xidmət etməsi:**

Təhsilalanlar müasir dünyanın elmi-texnoloji nailiyyətlərini dərindən mənimsəməli, istifadə etməli, lakin hazır məhsula aludə olmamalı, onun yalnız istehlakçısı deyil, həm də yaradıcısı və

# 100 YAŞLI ELM VƏ TƏHSİL MƏBƏDİ




istehsalçısı olmağa çalışmalı, bunun üçün daim öz üzərlərində işləməli, bilik və bacarıqlarını durmadan təkmilləşdirməlidirlər. Rəqəmsal biliklər və xarici dil bacarıqlarının verilməsi: Hər iki bacarıq mütləq yeni nəslə aşılanmalıdır. Bunlardan birincisi, tələb olunan minimum digital biliklər, ikincisi isə, gözəl və zəngin ana dilimizdən sonra xarici dilləri - ilk növbədə, müasir dünyanın elm və texnologiya dili olan ingilis dilini öyrənməkdir.

Ümumiləşdirmə aparsaq, milli-mənəvi dəyərlərə sadiq, Vətənə və dövlətə bağlı, rəqəmsal və xarici dil biliklərinə, geniş və müasir dünyagörüşünə, sağlam və müstəqil maraq dairəsinə sahib olan gənc mütəxəssislər və fəal vətəndaşlar yetişdirmək milli təhsilimizin profilini və prioritetlərini formalaşdırmağa kömək edəcək əsas hədəflərdəndir.

Bu ilin oktyabrında dövlət müstəqilliyimizin 30-cu ildönümü tamam olacaq. Müstəqillik dönəmində bütün həmvətənlərimizin ən böyük və ümdə arzusu işğal altındakı torpaqlarımızın azad edilməsi, ölkəmizin ərazi bütövlüyünün bərpa edilməsi olmuşdur. Nəhayət, ötən ilin 27 sentyabrında başlanan 44 günlük Vətən müharibəsində rəşadətli Silahlı Qüvvələrimiz müzəffər Ali Baş Komandan cənab İlham Əliyevin bilavasitə rəhbərliyi altında təcavüzkar Ermənistan ordusunu darmadağın edərək çoxəsrlik tariximizdə ən möhtəşəm qələbəni qazandı. Düşmən təslim aktını imzalamağa məcbur edildi, işğal altındakı torpaqlarımız qısa zaman kəsiyində geri qaytarıldı. Fəxr edirik ki, Vətən müharibəsində misilsiz qəhrəmanlıq göstərən əsgər və zabitlərimizin sırasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin 178 tələbə və məzunu da var. Tarixi qələbənin qazanılmasında payı olan Pedaqoji Universitetin təmsilçiləri olmağımızdan haqlı iftixar hissi keçiririk. İllər keçəcək, nəsillər dəyişəcək, amma 44 günlük qəhrəmanlıq savaşımız həmişə haqlı qürur mənbəyimiz olaraq qalacaqdır!

Zəfər sevincini yaşayan Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim və tələbə heyəti universitetin 100 illik yubileyinin keçirilməsinə xüsusi diqqət göstərən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə və Birinci vitse-prezident Mehriban xanım Əliyevaya dərin hörmət və minnətdarlığını bildirir.

Əlamətdar haldır ki, universitetimizin 100 yaşının tamam olduğu gün - 26 avqust həm də Azərbaycan Respublikasının Birinci vitse-prezidenti hörmətli Mehriban xanım Əliyevanın doğum günüdür. Xalqımız Mehriban xanımı ölkənin ictimai-siyasi həyatında mühüm rol oynayan görkəmli dövlət xadimi, təhsil və mədəniyyətimizin himayədarı, nəcib və xeyirxah əməllər sahibi kimi tanıyır. Bu əziz gündə Mehriban xanımı ADPU-nun elmi-pedaqoji kollektivi və tələbələri adından səmimi qəlbdən təbrik edir, ölkəmizin tərəqqisinə, insanların rifahının yüksəlməsinə yönəlmiş genişmiqyaslı və çoxşaxəli fəaliyyətində yeni uğurlar arzulayırıq. Dövlət rəhbərliyini və bütün həmvətənlərimizi əmin edirik ki, mövcudluğunun növbəti yüzilliyinə qədəm qoyan universitetimizin çoxminli kollektivi elm, təhsil, pedaqoji və elmi-pedaqoji kadr hazırlığı sahəsindəki fəaliyyətini bundan sonra daha böyük əzm və yaradıcılıq ruhu ilə davam etdirəcəkdir.

**Cəfər Cəfərov**
ADPU-nun rektoru,
tarix elmləri doktoru, professor

# 100 İLLİK TARİXİMİZDƏN İNCİLƏR

*"Azərbaycan Dövlət Pedaqoji İnstitutu böyük və çətin yol keçmişdir. Onun kollektivi Azərbaycan ümumtəhsil məktəbinin inkişafında böyük xidmət göstərmiş, institut xalq maarifi üçün yüksək ixtisaslı kadrlar ocağına çevrilmişdir. Özünü müəllimliyə həsr etmiş insan ən şərəfli insandır... Azərbaycan müəllimləri ən yüksək mənəviyyata, vətəndaşlıq hislərinə malik olan insanlardır".*

Heydər Əliyev
ADPU-nun 50 illik yubileyindəki nitqindən



ADPU-nun (o vaxtkı ADPİ) 50 illik yubileyi münasibəti ilə Bakı şəhəri F.E.Dzerjinski adına klubda (indiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzi) keçirilən təntənəli mərasimdə Azərbaycan SSR KP MK-nın birinci katibi H.Ə.Əliyev instituta "Qırmızı Əmək Bayrağı Ordeni"ni şəxsən təqdim edir (ordeni institutun bayrağına sancır).

Tarix: 28.02.1973
Foto: Azertac News Agency (Dövlət Kino-Foto Sənədləri Arxivi)



*Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yaradılmasının 50 illiyinə həsr olunmuş təntənəli yığıncağın rəyasət heyəti (soldan 2-ci) Azərbaycan KP MK birinci katibi H.Əliyev , Az.SSR Ali Soveti Rəyasət heyətinin sədri Q.Xəlilov, Az.SSR Nazirlər Sovetinin sədri A.İbrahimov, Azərbaycan KP MK katibi S.V.Kozlov*



*Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yaradılmasının 50 illiyinə həsr olunmuş təntənəli yığıncağın rəyasət heyəti*



*Azərbaycan KP MK birinci katibi H.Əliyev Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yaradılmasının 50 illiyinə həsr olunmuş təntənəli yığıncaqda çıxış edərkən.*

# YUBİLEY TƏDBİRLƏRİ

## UNİVERSİTET KOLLEKTİVİ FƏXRİ XİYABAN VƏ ŞƏHİDLƏR XİYABANINI ZİYARƏT EDİBLƏR









Avqustun 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi münasibətilə universitet rəhbərliyi, fakültə dekanları, ictimai və tələbə təşkilatlarının nümayəndələri Fəxri xiyabanda, Şəhidlər xiyabanında və İkinci Fəxri xiyabanda olublar. Əvvəlcə kollektiv Fəxri xiyabanda Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin xatirəsinə ehtiramını bildirdi, abidəsi önünə əklil qoydu. Daha sonra görkəmli oftalmoloq-alim Zərifə xanım Əliyeva, dövlət və ictimai xadim Əziz Əliyev və əməkdar elm xadimi, professor Tamerlan Əliyevin xatirələrini ehtiramla anaraq məzarları üzərinə gül dəstələri düzdü. ADPU kollektivi Pedaqoji Universitetin 100 illik fəaliyyəti dövründə yetişdirdiyi akademiklər Yusif Məmmədəliyev, Heydər Hüseynov, Zahid Xəlilov, xalq şairi Səməd Vurğun, İsmayıl Şıxlı, Süleyman Rəhimov, dövlət və ictimai xadim Şıxəli Qurbanov, Sovet İttifaqı Qəhrəmanları Xıdır Mustafayev, Fariz Səfərov, Səlahəddin Kazımov və başqalarının məzarlarını da ziyarət etdi.

Sonra Şəhidlər xiyabanını ziyarət edən kollektiv Şəhidlər xiyabanında əbədi məşəl kompleksi önünə əklil qoydu, şəhid türk əsgərlərinin xatirəsinə ucaldılmış abidəni ziyarət etdilər. Daha sonra İkinci Fəxri xiyabanı ziyarət edən universitet kollektivi Vətənimizin azadlığı uğrunda canından keçən şəhidlərin əziz xatirəsi önündə öz ehtiramını bildirdi.

Universitetin rektoru, professor Cəfər Cəfərov çıxış edərək qeyd edib ki, bundan bir əsr öncə məhz bu gün böyük ictimai-siyasi xadim Nəriman Nərimanovun imzaladığı dekretlə anadilli ilk ali təhsil müəssisəsi kimi fəaliyyətə başlayan Pedaqoji Universitet bu gün ölkəmizin ən geniş şəbəkəyə malik və köklü universitetlərindən biridir. Universitetin inkişafının böyük bir dövrü birbaşa ümummilli lider Heydər Əliyevin adıyla bağlıdır. Həmçinin Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev də müəllim yetişdirilməsi işinə həmişə yüksək diqqət göstərmiş və 17 aprel 2021-ci il tarixində "Azərbaycan Dövlət Pedaqoji Universitetinin yüz illik yubileyinin qeyd edilməsi haqqında" imzaladığı Sərəncam ADPU-nun fəaliyyətinə verilən yüksək qiymətin göstəricisidir. Universitet olaraq bu etimadın məsuliyyətini tam dərk edirik.

Pedaqoji Universitet ən müasir bilik və bacarıqlara, yüksək milli-əxlaqi dəyərlərə malik müəllim kadrları yetişdirmək işini bundan sonra da şərəflə davam etdirəcəkdir.

Bu əziz gündə Vətənimizin azadlığı və dövlətimizin müstəqilliyinin qorunması uğrunda canından keçən müqəddəs şəhidlərimizin xatirəsini yad etmək hər birimizin borcudur.

XƏBƏRİN VİDEOREPORTAJI

## MEDİA QURUMLARININ NÜMAYƏNDƏLƏRİ İLƏ GÖRÜŞ





İyunun 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi ilə əlaqədar universitet rəhbərliyi ölkənin aparıcı media qurumlarının nümayəndələri ilə görüş keçirib.

Görüşün məqsədi media qurumlarını ölkənin yeganə ixtisaslaşmış pedaqoji ali təhsil müəssisəsinin 100 illiyi ilə bağlı görülən işlər, universitetdə tətbiq edilən yeniliklər və qarşıda duran vəzifələrlə tanış etmək, bu sahədə Kütləvi İnformasiya Vasitələri (KİV) ilə əməkdaşlıq və qarşılıqlı fəaliyyət imkanlarını müzakirə etməkdir.

İlk olaraq bu yaxınlarda Kəlbəcərdə vəzifə borclarını icra edərkən ermənilərin basdırdığı minaya düşərək şəhid olan jurnalistlərimiz, – Azərbaycan Televiziyasının operatoru Sirac Abışov və AZƏRTAC-ın əməkdaşı Məhərrəm İbrahimovun xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Açılış nitqi ilə çıxış edən universitetin rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayaraq Pedaqoji Universitetin 100 illiyi ilə bağlı ölkə prezidenti İlham Əliyevin bu ilin aprelin 17-də sərəncam imzaladığını və burada ADPU-nun zəngin və məhsuldar inkişaf yoluna xüsusilə qiymət verildiyini qeyd edib. Son illər ərzində ali təhsil müəssisəsində bu istiqamətdə görülən işlərdən və aparılan islahatlardan, əldə olunan nəticələrdən danışan rektor hər bir sahədə olduğu kimi pedaqoji təhsilin inkişafında da cəmiyyətin güzgüsü olan medianın rolunu vurğulayıb, təhsil jurnalistikasının ali təhsilin inkişafıyla qarşılıqlı əlaqədə olduğunu bildirib.

Natiq bildirib ki, aparılan ardıcıl islahatlar nəticəsində artıq ötən il universitetdə pedaqoji ali təhsilin bütünlükdə tədris proqramı və planları yenidən işlənərək təstiq olunub, bütün pedaqoji ixtisaslarda inklüziv təhsil və

ardı 9-cu səhifədə

əvvəli 8-ci səhifədə

## MEDİA QURUMLARININ NÜMAYƏNDƏLƏRİ İLƏ GÖRÜŞ

STEM fənlərinin tədrisinə başlanılıb, artıq 2021-2022-ci tədris ilinin qəbul planında bakalavriat pilləsində ADPU və filiallar üzrə yeni ixtisaslar daxil edilib, ilk dəfə bu ildən riyaziyyat müəllimliyi və ibtidai sinif müəllimliyi ixtisasları üzrə ingilis bölməsi üzrə də qəbul aparılacaq. Bu vaxta qədər ADPU-da Azərbaycan və rus bölmələri fəaliyyət göstərirdi. İlk dəfə magistratura səviyyəsində pedaqogika ixtisaslaşması üzrə SABAH magistraturası və MBA ixtisaslaşması üzrə qəbul aparılacaq. Artıq ötən ildən etibarən ABŞ-ın Corc Vaşinqton Universiteti ilə birgə magistratura səviyyəsində Təhsil idarəetməsi ixtisası üzrə həyata keçirilən beynəlxalq ikili Diplom Proqramına bu il də dövlət hesabına qəbul həyata keçiriləcək.

Həmçinin son 1 il yarımda qlobal koronavirus pandemiyası səbəbindən təhsilin tamamən distant formata keçirilməsi ilə bağlı ADPU da öz imkanları çərçivəsində olduqca adekvat reaksiya göstərib və təhsilin fasiləsizliyini təmin edib. Universitetin sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev universitetin 100 illiyi ilə bağlı görülən bəzi işlər haqqında qısa təqdimatla çıxış edib, media nümayəndələrinə universitetin 100 illiyi münasibəti ilə nəşr olunan bəzi çap məhsullarının siqnal nüsxələri təqdim edilib. Daha sonra ADPU-nun Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsi tərəfindən hazırlanan ADPU tanıtım filmi nümayiş olunub.

Daha sonra jurnalistlərin sualları əsasında pedaqoji təhsilin inkişafı və yeniliklərlə bağlı ətraflı müzakirələr aparılıb.

Müzakirələrdə müvafiq olaraq universitetin rektoru, tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov Vətən müharibəsi iştirakçıları olan tələbələrə qayğı, işğaldan azad olunan bölgələrdə təhsil quruculuğunda Pedaqoji Universitetin rolu, yeni dövrün təhsil trendləri, bakalavriat, magistratura səviyyəsində tətbiq edilən yeniliklərlə bağlı jurnalistlərin suallarını cavablandırıblar.

Qeyd edək ki, görüşdə Azərbaycan Dövlət İnformasiya Agentliyi – AZƏRTAC, TREND İnformasiya Agentliyi, Report İnformasiya Agentliyi, APA İnformasiya Agentliyi, Türküstan İnformasiya Agentliyi, AZpress İnformasiya Agentliyi, Azxeber.com xəbər portalı, Editor İnformasiya Agentliyi, Təhsil.biz xəbər portalı, Məktəb Guşəsi təhsil portalı, Azərbaycan Universitetləri səhifəsinin və digər xəbər saytlarının nümayəndələri, universitetin rektoru, prorektorları, müvafiq struktur rəhbərləri iştirak edib.

# RESPUBLİKAMIZIN ALİ TƏHSİL OCAQLARI PEDAQOJİ UNİVERSİTETİN 100 İLLİK YUBİLEYİNİ QEYD EDİRLƏR

## BDU-DA ADPU-NUN 100 İLLİK YUBİLEYİ QEYD OLUNUB





İyun ayının 16-da Bakı Dövlət Universitetində (BDU) Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr edilmiş dəyirmi masa keçirilib. Pandemik şəraitlə bağlı sanitar-gigiyenik tələblərə uyğun məhdud sayda iştirakçı ilə keçirilən tədbirdə hər iki ali təhsil müəssisəsinin rektorları və rəhbər heyəti iştirak edib.

Dəyirmi masanı giriş sözü ilə açan BDU-nun rektoru, dosent Elçin Babayev Pedaqoji Universitetin nümayəndələrini salamlayaraq ali təhsil müəssisəsinin 100 illik yubileyi münasibəti ilə təbrik edib. O, çıxışında ADPU-nun qurucularının xatirələrini yad edərək universitetin ölkəmizin milli pedaqoji təhsil sferasında hər zaman xüsusilə fərqləndiyini qeyd edib.

Ulu öndər Heydər Əliyevin daim ADPU-ya diqqətindən danışan rektor həmçinin, bu yaxınlarda ölkə prezidenti İlham Əliyevin imzaladığı Pedaqoji Universitetin 100 illik yubileyinin keçirilməsi haqqında Sərəncamda universitetin fəaliyyətinə olduqca yüksək qiymət verildiyini vurğulayıb.

E.Babayev qeyd edib ki, BDU və ADPU-da elmi-pedaqoji fikrin inkişafı sahəsində daim birgə əməkdaşlıq əlaqələri mövcud olmuşdur və bu əlaqələr bu gün də yüksək səviyyədə davam edir. Belə ki, ADPU-nun 31 rektordan 11-i BDU-nun, BDU-nun 25 rektorundan 3-ü isə ADPU-nun məzunudur. Həmçinin Cəfər Xəndan, Cəbrayıl Ələsgərov və Mehdi Əliyev müxtəlif illərdə həm BDU-ya, həm də ADPU-ya rəhbərlik etmişlər.

Pedaqoji Universitetin 70-dən çox elmlər doktorundan 20-yə qədəri BDU məzunudur, digər yandan bu gün 100-dən çox ADPU məzunu BDU-da müxtəlif vəzifələrdə çalışır. Natiq çıxışının sonunda qeyd edib ki, Pedaqoji Universitetin 100 illiyi təkcə ADPU-nun yox, bütün Azərbaycan xalqının bayramıdır və BDU ADPU-nun yubileyi ilə bağlı tədbirlərini davam etdirəcək. Çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov göstərilən diqqətə və qonaqpərvərliyə görə BDU-nun rəhbərliyinə təşəkkür edib və bildirib ki, 100 illik yubiley tədbirləri çərçivəsində ilk olaraq BDU-nun yubileyin keçirilməsi ilə bağlı təşəbbüsü çox önəmlidir. Prof. C.Cəfərov qeyd edib ki, 1921-ci ildə cəmi 6 tələbə ilə fəaliyyətə başlayan Dövlət Pedaqoji Universiteti bu gün özünün 160 mindən çox yüksəkixtisaslı məzunu ilə fəxr edir. Təkcə onu demək kifayətdir ki, AMEA-nın 11 prezidentindən 3-ü ADPU məzunudur və onlar ümumilikdə 27 il ölkəmizin elm məbədinə rəhbərlik etmişlər. 5 dəfə ADPU-da olan ulu öndər Heydər Əliyevin hakimiyyət illəri isə ADPU-nun tarixində xüsusi inkişaf mərhələsi kimi ayrılır.

Universitetdə aparılan islahatlar, yeni tədris mühitinin yaradılması və əldə olunan uğurlardan danışan rektor vurğulayıb ki, həm tədris, həm maddi-texniki sahədə son 5 ildə universitetdə əsaslı yenilənmələr aparılmışdır və artıq xeyli müsbət nəticələr əldə edilmişdir. Bu gün MİQ imtahanlarında yüksək nəticə göstərən ADPU məzunları 2016-cı illə müqayisədə 400 faiz daha yaxşı nəticə göstərərək 70 faizə qədər mütləq üstünlüyü təşkil edir. Universitetin 2020-ci ildəki məzunlarından 51,5 faizi işlə təmin olunub.

Həmçinin 53 xarici universitetlə əlaqələri olan universitetin beynəlxalq əməkdaşlıq sahəsində son illərdəki böyük uğurlarından olan ABŞ-ın Corc Vaşinqton Universiteti ilə ikili Diplom Proqramı uğurla davam edir və artıq gələn ildən qəbul planının 25-dən 40-a qaldırılması planlaşdırılır.

Yeni tədris ilindən etibarən ADPU-da MBA və SABAH magistraturasına, həmçinin iki ixtisasda bakalavriat səviyyəsində ingilis bölməsinə qəbul aparılacaq. 100 illiyini geridə qoyan Pedaqoji Universitet 2025-ci il üçün hazırlanacaq inkişaf konsepsiyasında təhsilalanlara milli mənlik şüuru əsasında daha çox iki komponent, – rəqəmsal biliklər və xarici dil kompetensiyalarının aşılanmasını hədəf kimi nəzərdə tutur. Çıxış edənlərdən BDU-nun Sosiologiya kafedrasının professoru İzzət Rüstəmov və universitetin beynəlxalq əlaqələr üzrə prorektoru, ADPU-da məsul vəzifələrdə çalışmış Şahin Panahov Pedaqoji Universitetlə bağlı xatirələrini bölüşüb, ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov isə ADPU-nun çətin və şərəfli inkişaf yolundakı maraqlı məqamlara nəzər salıb. Tədbir çərçivəsində Pedaqoji Universitetə aid nəşrlərin yer aldığı sərgi təqdim edilib. Sonda yubiley münasibəti ilə qarşılıqlı xatirə hədiyyələri təqdim edilib.

XƏBƏRİN VİDEOREPORTAJI

# ADMİU VƏ ADPU ARASINDA ƏMƏKDAŞLIQ MÜQAVİLƏSİ İMZALANIB

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetində (ADMİU) qeyd olunub. İyunun 18-də ADPU-nun 100 illik yubileyi münasibətilə ADMİU-da dəyirmi masa keçirilib.

ADMİU-nun rektoru, professor Ceyran Mahmudova çıxış edərək qonaqları salamlayıb və yubiley münasibətilə çoxminlik ADPU kollektivini təbrik edib. Rektor bildirib ki, çox az xalqlar var ki, özünün belə güclü pedaqoji ali təhsil müəssisəsi var. Pedaqoji Universitet fəaliyyət göstərdiyi bir əsr ərzində çox vacib bir missiyanı, - cəmiyyət üçün müəllim hazırlamaq vəzifəsini daşıyır. Bu olduqca məsuliyyətlidir və müəllim hazırlığı sahəsində son illər ADPU-da aparılan ardıcıl islahatlar təqdirəlayiqdir.

Göstərilən diqqətə görə ADPU kollektivi adından öz təşəkkürünü bildirən universitetin rektoru, professor Cəfər Cəfərov cari ilin aprel ayında ölkə başçısı tərəfindən ali təhsil müəssisəsinin 100 illik yubileyinin keçirilməsi haqqında sərəncam imzaladığını, burada Pedaqoji





Universitetin fəaliyyətinə olduqca böyük qiymət verildiyini diqqətə çatdırıb və digər universitetlərin, o cümlədən ADMİU-nun bu ümumxalq bayramına verdikləri töhfəyə görə minnətdarlığını bildirib. Rektor çıxışında ADPU-nun tarixi inkişafı, keçdiyi zəngin elmi-pedaqoji yol və son dövrlərdə aparılan genişmiqyaslı fəaliyyət nəticəsində pedaqoji təhsilin ölkədə yenidən öz nüfuzunu bərpa etdiyini diqqətə çatdırıb. Yubileyin özünün və cəmiyyətin qarşısında hesabat və yeni strategiya üçün fürsət olduğunu deyən prof. C.Cəfərov ADPU-nun əldə etdiyi uğurlar və tətbiq etdiyi yeniliklər, genişlənən xarici əlaqələr haqqında geniş məlumat verib, yeni yüzilliyin ilk beşilliyinin hədəflərindən söz açıb. ADMİU-nun elm və yaradıcılıq işləri üzrə prorektoru, dosent Sədaqət Əliyeva Pedaqoji Universitetin tarixi haqqında məruzə edib, həmçinin arxiv materialları əsasında hazırlanmış videoçarx nümayiş olunub. Daha sonra ADMİU-nun tədris işləri üzrə prorektoru, ADPU-nun məzunu olan professor Validə Məmmədova, kafedra müdirləri, professor Əli Əmirli və ADPU-nun aspirantı olmuş dosent Yeganə Eyvazova, ADPU-nun məzunu, baş müəllim Əminə Qədimova, ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsinin dekanı, dosent Laçın Həsənova və kafedra müdiri, professor Zemfira Abdullayeva çıxış edərək öz təəssüratlarını bölüşmüş və Pedaqoji Universitetin cəmiyyətimizin həyatında oynadığı müstəsna rola diqqət çəkmişlər. Çıxışlardan sonra hər iki ali təhsil müəssisəsi arasında əməkdaşlığa dair müqavilənin imzalanma mərasimi keçirilib. Müqaviləni rektorlar imzalayıblar.

Qeyri-rəsmi hissədə ADMİU-nun yaradıcı kollektivi ADPU-nun 100 illiyi münasibətilə hazırlanmış xüsusi konsert proqramı ilə çıxış ediblər.

XƏBƏRİN VİDEOREPORTAJI

# UNİVERSİTETLƏRARASI ELMİ-PRAKTİK SEMİNAR

Mayın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi münasibəti ilə ADPU-nun Şəki Filialının təşəbbüsü ilə ADPU, ADPU-nun Şəki Filialı və Mingəçevir Dövlət Universiteti (MDU) arasında ali məktəblərdə xarici dillərin öyrədilməsi mövzusunda universitetlərarası onlayn elmi-praktik seminar keçirilib.

Tədbirdə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbirin önəmini qeyd edərək bu il ölkənin yeganə ixtisaslaşmış ali pedaqoji təhsil müəssisəsinin 100 illik yubileyinin tamam olduğunu vurğulayıb. O, tədbirə və göstərilən diqqətə görə MDU rəhbərliyinə təşəkkürünü bildirib. Həmçinin bu il ADPU-nun Şəki Filialının da 30 illik yubileyinin tamam olduğunu bildirərək, belə təşəbbüslərin çox faydalı olacağına əminliyini ifadə edib.

MDU-nun rektoru, iqtisad üzrə fəlsəfə doktoru Şahin Bayramov öz növbəsində Pedaqoji Universitetin 100 illiyinə töhfə verənlər arasında olduqlarına görə şad olduğunu deyərək universitet rəhbərliyini təbrik edib, qarşılıqlı əlaqələrin daha da genişləndirilməsinin əhəmiyyətini qeyd edib. O bildirib ki, ADPU bu gün ölkənin ən köklü və ən qabaqcıl, bir çox ali təhsil müəssisələrinə örnək olmuş elm-təhsil məbədi olmaqla yanaşı, həm də beynəlxalq əlaqələrini də günü-gündən genişləndirən pedaqoji ali təhsilin flaqmanıdır. ADPU-nun Şəki Filialının direktoru, dosent Rafiq Rəsulov da öz növbəsində filialın ötən əsrin 90-cı illərindən bəri bölgədə ali təhsilin təşəkkülündə önəmli rol oynadığını vurğulayıb.

MDU-nun Pedaqoji fakültəsinin dekanı, dosent Nizami Zeynalovun moderatorluğu ilə seminar xarici dillərin tədrisinin vacib aspektləri haqqında məruzələrlə davam edib. ADPU-nun Şəki Filialının müəllimləri Ulduz Mürşü-dova "ADPU. Müəllim hazırlığının baza ali təhsil müəssisəsi" və "ADPU-nun Şəki Filialı – 30", Səfura Əbdürrəhmanova "İbtidai siniflərdə ingilis dilinin tədrisində mahnılardan istifadə", MDU-nun dosenti Zemfira Əzizova "Xarici dillərin tədrisinin aktual problemləri", universi-tetin müəllimi Fəxriyyə Məbudova isə" Beynəlxalq kommuni-kasiyalarda ingilis dilinin əhəmiyyəti" mövzularında ətraflı və aktual məruzələrlə çıxışlar ediblər. ADPU-nun Şəki Filialının müəllimi Gülarə Abdullayeva və MDU-nun müəllimi Dürdanə Qurbanova məruzələr ətrafında öz müsbət fikirlərini bildiriblər.

Seminarın bədii hissəsində MDU-nun tələbələri Qabil Yusifov, Günel Eyvazova, Səidə Abdullayeva, Arzu Əliyeva, ADPU-nun Şəki Filialının tələbələri Rüxsarə Zamanova, Pınar Heydərova, Günay Hüseynli və Rəfiqə Məsimovanın Azərbaycan və dünya ədəbi irsinə aid klassik və müasir şeirləri Azərbaycan, rus, ingilis, fransız və alman dillərində səsləndirmələri olduqca maraqla qarşılanıb.

Tədbirdə həmçinin ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov və sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev və ADPU-nun Şəki Filialının və MDU-nun 200-dək müəllim və tələbələri iştirak edib.



## SDU-DA ONLAYN ELMİ-PRAKTİK KONFRANS





İyunun 24-də Sumqayıt Dövlət Universitetində (SDU) Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunmuş "Azərbaycanda elmin və təhsilin inkişafında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda onlayn elmi-praktik konfrans keçirilib.

Giriş sözü ilə çıxış edən SDU-nun rektoru, professor Elxan Hüseynov Pedaqoji Universitetin ölkəmizin elm və təhsil tarixində, pedaqoji fikrin inkişafında olduqca önəmli rola sahib olduğunu vurğulayaraq bu gün bu ali təhsil müəssisəsinin 100 illik yubileyinin dövlət səviyyəsində qeyd edilməsinin əhəmiyyətindən söz açaraq ADPU kollektivini təbrik edib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov göstərilən diqqətə görə minnətdarlığını bildirərək universitetin fəaliyyəti ərzində ölkəmizin adını yüksəklərə qaldıran onlarla tanınmış alimlər və şəxsiyyətlər yetişdirdiyini və bir çox pedaqoji-metodoloji elmlərin əsasının Azərbaycanda məhz burada qoyulduğunu və inkişaf etdiyini, universitetdə bu gün də müasir təhsil trendlərinə uyğun qabaqcıl müəllim hazırlığı sahəsində ciddi tədbirlərin icra olunduğunu vurğulayıb.

Daha sonra SDU-nun Filologiya fakültəsinin dekanı, dosent, ADPU-nun məzunu Sevinc Həmzəyevanın "Azərbaycanda elmin və təhsilin inkişafında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" və ADPU-nun professoru, Universitet Ağsaqqallar Şurasının sədri Məlikməmməd Cəbrayılovun "Azərbaycanın ictimai-siyasi və mədəni həyatında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzularında məruzələri dinlənilib.

ADPU-nun məzunu olan SDU-nun dosentləri Cavid Məmiyev, Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri Xalidə Həsənova, Pedaqogika və psixologiya kafedrasının müdiri Aytəkin Məmmədova da çıxış edərək öz təəssüratlarını bölüşüb, Pedaqoji Universitetin müasir təhsil islahatlarının həyata keçirilməsindəki rolundan danışıblar.

## LDU-DA ONLAYN KONFRANS KEÇİRİLİB



İyunun 29-da Lənkəran Dövlət Universitetində (LDU) Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunan "Azərbaycanda müəllim kadrların hazırlanmasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda onlayn konfrans keçirilib.

Konfransı giriş sözü ilə açan LDU-nun rektoru, professor Natiq İbrahimov Pedaqoji Universitet kollektivini 100 illik yubiley münasibəti ilə təbrik edərək ADPU-nun ölkəmizin təhsil quruculuğunda flaqmanlardan biri olduğunu qeyd edib. Çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov diqqətə görə LDU rəhbərliyinə təşəkkürünü bildirib və ADPU-nun bir əsr ərzində keçdiyi inkişaf yolu və 100 illik ərəfəsində strateji yanaşmaları haqqında məlumat verərək bu işlərdə regionlarla qarşılıqlı əməkdaşlığın önəmini qeyd edib. LDU da bu sırada əhəmiyyətli yer tutur. Daha sonra LDU-nun İbtidai təhsil və məktəbəqədər təlim kafedrasının müdiri, f.ü.f.d., dosent, ADPU-nun məzunu Ayəddin Əliyev "Azərbaycanda müəllim kadrların hazırlanmasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov isə "Azərbaycanın ictimai-siyasi həyatında və elm aləmində Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda məruzə ilə çıxış ediblər. Çıxış edənlərdən LDU-nun tədrisin təşkili və təlim texnologiyaları üzrə prorektoru, dosent İdrak Əsgərov konfransın qarşılıqlı əlaqələrin inkişafına verəcəyi töhfədən söz açıb, Pedaqoji Universitetin 100 illik yubileyinin keçirilməsinin ölkə miqyaslı əlamətdar tarixi hadisələrdən biri olduğunu qeyd edib.

## BMU-DA ONLAYN GÖRÜŞ



İyunun 30-da ADPU-nun 100 illik yubileyi münasibəti ilə keçirilən tədbirlər çərçivəsində Bakı Mühəndislik Universitetində (BMU) onlayn görüş təşkil olunub.

Görüşdə giriş sözü ilə çıxış edən BMU-nun rektoru, texnika elmləri doktoru, professor, Azərbaycan Respublikasının əməkdar elm xadimi, "Şöhrət" ordeni laureatı Havar Məmmədov Pedaqoji Universitet kollektivini təbrik edib və universitetin 100 illik tarixi inkişaf yoluna geniş rakursdan nəzər salaraq bildirib ki, hər şeydən əvvəl universitetin daşıdığı ad və bu illər ərzində müəllim peşəsinin yüksək nüfuzunun yaradılmasında, son dövrlərdə yenidən bərpa edilməsində oynadığı rol ali təhsil müəssisəsinin əhəmiyyətini göstərir.

Rektor çıxışında bildirmişdir ki, xüsusən ingilisdilli pedaqoji ixtisaslar sahəsində ADPU və BMU-nun geniş əməkdaşlıq imkanları var.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov göstərilən diqqətə görə təşəkkür edib və bildirib ki, universitetin 100 illiyini qeyd elədiyi böyük qələbə dövrü eyni zamanda bizim önümüzdə yeni vəzifələr qoyur. ADPU bu çağırışları anlayır və cəmiyyətin tələblərinə maksimum müsbət reaksiya vermək istiqamətində ciddi addımlar atılır. Belə ki, artıq bakalavr səviyyəsində pedaqoji ixtisaslaşmaların hamısı üçün yeni tədris planları hazırlanaraq təsdiq edilmişdir.

Universitet növbəti ildən etibarən iki ixtisasda ingilis bölməsi üzrə, magistratura səviyyəsində isə MBA və SABAH magistraturaları üzrə kadr hazırlığına başlayır, yaxınlarda universitetdə STEM laboratoriyasının qurulması planlanır. Universitetdə məzunların məşğulluq vəziyyətinin monitorinqinə başlanılıb. MİQ imtahanlarında ADPU məzunlarının nəticələri son illərdə ilk yerləri tutur. Ali təhsil müəssisəsində elmi tədqiqatlar və beynəlxalq əlaqələr sürətlə inkişaf edir. Daha sonra çıxış edən ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov hələ cümhuriyyət dövründən milli dildə ilk ali təhsil ocağı kimi institutun yaradılması üçün aparılan işlərdən, BMU-nun kafedra müdiri Emin Ağayev isə Pedaqoji Universitetin Azərbaycan dilçilik elminin inkişafında oynadığı rol haqqında məruzə ediblər.

## NDU-DA HİBRİD KONFRANS

Sentyabrın 8-də ADPU-nun 100 illik yubileyi münasibətilə Naxçıvan Dövlət Universitetində (NDU) birgə konfrans keçirilib.

Həm əyani, həm də onlayn təşkil olunan hibrid konfransı giriş sözüylə açan NDU-nun rektoru Elbrus İsayev Pedaqoji Universitetin professor-müəllim və tələbə heyətini 100 illik yubiley münasibətilə təbrik edib, müstəqil Azərbaycanın inkişafı yolunda apardıqları məsuliyyətli işlərdə yeni-yeni nailiyyətlər arzulayıb. Rektor bildirib ki, rəhbərlik etdiyi ali təhsil ocağı 1967-ci ildə məhz Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Naxçıvan filialı kimi fəaliyyətə başlayıb, 1972-ci ildə bu filialın bazasında Naxçıvan Dövlət Pedaqoji İnstitutuna, 1990-cı ildə isə Naxçıvan Dövlət Universitetinə çevrilib. Bununla da Naxçıvan filialı gələcək ali məktəbin təməl daşını qoymaqla Muxtar Respublikanın ilk ali təhsil ocağı kimi burada yüksəkixtisaslı kadrların yetişdirilməsinə, bütövlükdə regionun tərəqqisinə öz müsbət təsirini göstərib.

Tədbirə onlayn qoşulan ADPU-nun rektoru, professor Cəfər Cəfərov Prezident İlham Əliyevin 2021-ci il aprelin 17-də "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamını tədbir iştirakçılarının diqqətinə çatdırıb. Rektor 1921-ci ildə əsası qoyulan və ölkəmizin təhsil tarixində xüsusi yeri olan zəngin maarifçilik ənənələrinə malik ali təhsil müəssisəsinin beynəlxalq əməkdaşlıq əlaqələrinin davamlı genişləndirilməsi və elmi-pedaqoji təhsilin müasir standartlara uyğunlaşdırılması istiqamətində ardıcıl həyata keçirilən işlər barədə danışıb.



NDU-nun Azərbaycan tarixi kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Zəhmət Şahverdiyev 100 illik şərəfli yol keçən Universitetin məzunu olduğundan fəxr hissi duyduğunu bildirib.

ADPU-nun Riyazi analiz kafedrasının professoru Məlikməmməd Cəbrayılov, NDU-nun Kimya kafedrasının dosenti Akif Əliyev universitetlə bağlı xatirələrini bölüşüblər.

Sonda NDU-nun rektoru E.İsayev ADPU-nun adına hazırlanmış sertifikat və hədiyyəni, həmçinin ADPU-nun rektoru prof. C.Cəfərov ADPU kollektivi adından NDU-ya hədiyyə təqdim edib.

# RESPUBLİKA TƏHSİL İCTİMAİYYƏTİ PEDAQOJİ UNİVERSİTETİ TƏBRİK EDİR

**Azərbaycan Respublikası Təhsil Nazirliyi**
26 Ağu

26 avqust Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) fəaliyyətə başlamasının 100 illiyi tamam olur.

Ölkəmizdə yüksəkixtisaslı pedaqoji kadr hazırlığında böyük xidmətləri olan universitetin kollektivini təbrik edir, şərəfli və məsuliyyətli fəaliyyətlərində uğurlar arzulayırıq.

#ADPU100

Azərbaycan Respublikası
Təhsil Nazirliyi

**Emin Amrullayev**
26 Ağu

Bu gün respublikamızın ilk müəllim hazırlığı həyata keçirən ali təhsil ocağının – Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 yaşı tamam olur. Prezident İlham Əliyev 21 aprel 2021-ci il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin keçirilməsi ilə bağlı sərəncam imzalayıb. Fəaliyyətə başladığı zamandan etibarən elmi-pedaqoji kadr hazırlanması işini uğurla həyata keçirmiş universitet hazırda da müasir tədqiqatlara əsaslanaraq və innovativ təlim-tədris texnologiyalarından istifadə edərək yüksək mənəviyyata, vətəndaşlıq hislərinə malik Azərbaycan müəllimləri yetişdirir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim və tələbə heyətini təbrik edir, onlara Azərbaycanda təhsilin inkişafı naminə görəcəyi bütün işlərdə uğurlar arzulayıram.

Emin Əmrullayev
Azərbaycan Respublikası təhsil naziri

**Elçin Babayev**
@RectorBabayev

Doğma Azərbaycan Dövlət Pedaqoji Universiteti, bir əsrlik yubileyin mübarək!
BDU və ADPU-nu bir çox ortaq dəyərlər birləşdirir.
Ölkəmizin təhsil tarixində xüsusi yer tutan, zəngin ənənələrə malik ADPU-ya vətənimiz üçün layiqli pedaqoji kadr hazırlığının yeni mərhələsində uğurlar!

Elçin Babayev
BDU-nun rektoru, dosent

**Ədalət Muradov**
11h

100 yaşın mübarək, ADPU!
Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivini UNEC ailəsi adından təbrik edir, möhkəm can sağlığı, bol-bol uğurlar arzulayıram. İnanıram ki, bu universitet gələcəkdə də öz missiyasını uğurla yerinə yetirəcək.
Uğurlar!

Ədalət Muradov
UNEC-in rektoru, i.e.d.

**Vilayət Vəliyev**
1h

Bu gün ölkəmizin ən qədim tarixə malik ali təhsil müəssisələrindən olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyidir. Bu münasibətlə AzTU ailəsi adından Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivini təbrik edir, gələcək fəaliyyətlərində uğurlar arzulayırıq!
Təbriklər ADPU!

Vilayət Vəliyev
AzTU-nun rektoru, professor

**Gülçöhrə Məmmədova**

26 avqust Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) fəaliyyətə başlamasının 100 illiyi tamam olur. Azərbaycan Dövlət Pedoqoji Universitetinin kollektivini AzMİU kollektivi adından təbrik edir, şərəfli və məsuliyyətli fəaliyyətlərində uğurlar arzulayırıq.

Gülçöhrə Məmmədova
AzMİU-nun rektoru, professor

**İbrahim Cəfərov**
1m

Dəyərli dostlar, bu günlər ölkənin təhsil ictimaiyyəti Azərbaycan Dövlət Pedaqoji Universiteti yaranmasının 100 illik yubileyini qeyd edir. Ölkə təhsil sisteminə on minlərlə müəllim kadrları yetişdirən bu təhsil ocağı böyük hörmətə layiqdir, son illər universitet özünün modernliyi, müasirliyi, təhsilə yeni yanaşmalar ilə fərqlənir. ADAU ailəsi adına hörmətli Cəfər müəllim başda olmaqla həmkarlarımızı təbrik edir, Azərbaycan təhsili naminə uğurlar arzulayırıq. Yubileyiniz mübarək!!!

İbrahim Cəfərov
ADAU-nun rektoru, professor

**Elbrus Isayev**
4h

1 əsrlik şərəfli yol keçən Azərbaycan Dövlət Pedaqoji Universitetinin 💯 yaşı tamam oldu. Naxçıvan Dövlət Universitetinin bütün kollektivi adından bu təhsil məbədinin rəhbər heyətini, bütün əməkdaşlarını, tələbələrini təbrik edir, ölkəmizin pedaqoji kadrlara olan ehtiyacını bundan sonra da layiqincə təmin edəcəyinə əminliyimizi bildiririk!

Elbrus İsayev
NDU-nun rektoru, dosent

# PEDAQOJİ UNİVERSİTETİ GƏLƏCƏYƏ APARANLAR

Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi respublikamızın təhsil ictimaiyyəti üçün olduqca əlamətdar bir bayramdır.

Bu fərəhli gündə universitetimizin on minlərlə məzunlarını – öz pedaqoji fəaliyyətləri ilə həyatlarını gənc nəslin təlim-tərbiyəsinə, bilik və bacarıqlarının inkişafına həsr edən ən şərəfli peşənin sahiblərini təbrik edirik.

Sizi əmin edirik ki, bundan sonra da elm və təhsildə yüksək nailiyyətlər əldə etmək üçün səylərimizi əsirgəməyəcəyik. Bu yolu əzmkarlıqla davam etdirərək Azərbaycan gənclərinin inkişafına öz töhfələrimizi verəcəyik.

Şərəfli və müqəddəs yolda bütün həmkarlara və tələbələrə uğurlar arzulayıram!



**Tədris işləri üzrə prorektor**
**dosent Eldar Aslanov**

Hörmətli həmkarlar,

Azərbaycanın aparıcı ali məktəblərindən biri – zəngin tarixə malik Azərbaycan Dövlət Pedaqoji Universitetinin ölkəmizin inkişafında mühüm xidmətləri danılmazdır. Bu gün Azərbaycan elmini və təhsilini ADPU məzunları olmadan təsəvvür etmək çətindir. Universitet tədris prosesini daim təkmilləşdirərək elmi-tədqiqat fəaliyyətini və beynəlxalq əlaqələrini inkişaf etdirməklə rəqəmsal texnologiyalara doğru inamla irəliləyir. Zəfər tariximizin bir ili ərəfəsində bir əsrlik yubiley münasibətilə ADPU-nun rəhbərliyini, professor müəllim heyətini, əməkdaşlarını təbrik edir, elm və təhsil fəaliyyətinin bütün sahələrində uğurlar arzulayıram. İnanıram ki, bu möhtəşəm yubiley gələcək layihələrin reallaşması üçün impuls rolunu oynayacaqdır.



**Elm və innovasiyalar**
**üzrə prorektor**
**professor Asəf Zamanov**



Azərbaycan Dövlət Pedaqoji Universiteti 100 ilin astanasındadır. Bu qədim elm ocağı üçün söylənən sözlər bəzən onun fəaliyyətinin geniş spektrini əhatə etməyə imkan vermir. Əsası elmin və təhsilin yüksəlişi prinsipi üzərində qurulmuş universitetin məzunları respublikamızda, eləcə də ölkədən kənarda layiqincə xidmət edir. Həm Azərbaycanımızın çiçəklənməsi yolunda fəaliyyət göstərir, həm də universitetin adını uca tuturlar. Universitet auditoriyalarında yüzlərlə mütəxəssis yetişərək hazırda çalışdıqları sahələrdə böyük uğurlar qazanır, təhsildə əldə etdikləri bilik və bacarıqlar sayəsində ölkəmizin inkişafı və tərəqqisinə öz töhfələrini bəxş edirlər.

Əminəm ki, xalqımızın inkişafı naminə peşəkar kadrların hazırlanmasında universitetin pedaqoji kollektivi bundan sonra da səy və bacarıqlarını əsirgəməyəcək, zəngin təcrübə və ənənə sayəsində qarşıda duran vəzifələr layqincə yerinə yetiriləcəkdir.

Universitetin bir əsrlik yubileyini böyük fərəh hissi ilə təbrik edirəm!

**Sosial və humanitar məsələlər üzrə**
**prorektor**
**professor Fikrət Rzayev**

## GETDİYİMİZ YOL

Dəyərli həmkarlar və əziz tələbələr!

Bu yolun hazırkı məqamında təkcə o dəyərlərin daşıyıcısı olduğunuza görə deyil, həmin dəyərlərin cəmiyyətimiz üçün dərinləşməsi və genişlənməsi işində yerinizi vurğulamaqla, hər birinizi şərəfli yubiley münasibəti ilə təbrik edirik.

Bu o yoldur ki, həmin yolu çəkən və 100 il əvvəl onun yolçuluğuna çıxan insanlar sözün birbaşa mənasında, təhsil mücahidləri kimi qəbul edilir.

Biz – bu il bir əsrlik yubileyini böyük qürur hissi ilə keçirməyə hazırlaşan Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi onunla fəxr edə bilərik ki, universitetimizin heç də hamar olmayan keçdiyi yollarında həmin prinsiplər qorunaraq saxlanılmışdır.

Buna görədir ki, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 2021-ci il aprelin 17-də imzaladığı "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamda universitetin fəaliyyəti bu cür qiymətləndirilir: "Universitetin çox sayda məzunları vardır. İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir". Universitetimizdə beynəlxalq



fəaliyyətin tənzimlənməsi və inkişafı üzrə xətt ölkəmizdə hələ 90-cı illərin sonlarında əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulan və cənab Prezidentimiz İlham Əliyev tərəfindən yaradıcılıqla inkişaf etdirilən təhsil islahatlarının məntiqi davamı olan təhsil siyasətinin tərkib hissəsidir. O siyasətin fəlsəfəsi Azərbaycan təhsilini artıq öz sistemini yarada bilməklə bərabər, uğurlu nəticələrini qazanmış ölkələrin təhsil təcrübələri ilə zənginləşdirməkdən ibarətdir. Milli təhsilimizin ən yaxşı ənənələrini qoruyub, inkişaf etdirmək, onun dünya təhsilinin mütərəqqi və qabaqcıl metodologiyasının özünü doğrultmuş, təsdiq etmiş elementləri ilə sintezinə nail olmaq təhsil siyasətinin başlıca hədəfidir.

**Beynəlxalq əlaqələr**
**üzrə prorektor**
**professor Mahirə Hüseynova**



Pedaqoji Universitetin 100 illik yubileyi respublikamızın təhsil ictimaiyyəti üçün böyük hadisədir.

Ali təhsil ocağının kollektivi təlim-tərbiyə işinin keyfiyyətinin yüksəldilməsi üzərində məqsədyönlü surətdə durmadan çalışır. Peşəkar müəllimlərin, əməkdaşların və istedadlı alimlərin fəaliyyəti sayəsində universitet hazırda dünyanın müxtəlif bölgələrindən soraqları gələn, ölkəmizin hər bir guşəsində çalışan minlərlə müəllim, magistr, fəlsəfə doktoru və elmlər doktoru hazırlayıb.

Universitetin 100 illik yubileyinin qeyd olunması haqqında ölkə Prezidenti cənab İlham Əliyevin imzaladığı Sərəncamda da ali təhsil müəssisəsinin fəaliyyətinə hərtərəfli qiymət verilir. Bu səbəbdən Pedaqoji Universitetdən yolu keçən hər kəs özünü şanslı hesab edə bilər.

Bütün kollektivi təbrik edir, yeni yüzillikdə yenilənən universitetimizə böyük nailiyyətlər arzu edirəm!

**Ümumi işlər üzrə prorektor**
**Tural Cəlilov**

# PEDAQOJİ UNİVERSİTETİ GƏLƏCƏYƏ APARANLAR

Bu ərəfələrdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin fəaliyyətə başlamasının 100 illik yubiley bayramını qeyd edirik. Ölkə Prezidenti İlham Əliyev tərəfindən universitetin yubileyinin dövlət səviyyəsində qeyd olunması ilə bağlı Sərəncam imzalanıb.

Pedaqoji Universitet yarandığı gündən etibarən xalqımız üçün strateji önəmə sahib şərəfli missiyanı uğurla yerinə yetirmişdir və bu gün də öz missiyasını uğurla davam etdirir. Bu gün Universitet XXI əsrin qalib Azərbaycanı üçün dayanıqlı inkişafın sağlam təməllərini qoruyan müəllimlər yetişdirmək yolunda dövlətin strateji yol xəritələrinə uyğun olaraq müvafiq tədbirlər həyata keçirir. Müəllim hazırlığında innovasiyaların tətbiqi ilə yanaşı ali təhsil ocağı müvafiq aparıcı yerli və beynəlxalq təsisatlarla daimi əməkdaşlıq və fikir mübadiləsi edir.



İnanıram ki, Pedaqoji Universitet öz yubileyini yenilənmə və reform dövrünə çevirərək daha da böyük uğurlara imza atacaq.

Universitetin kollektivini, tələbələrini və çoxminli məzun ordusunu ürəkdən təbrik edirəm. Sizlər şanlı tarixin qurucuları və daşıyıcılarısınız.

**Strateji inkişaf məsələləri üzrə prorektor**
**Könül Pirverdiyeva**

Hörmətli həmkarlar!

Bu günlərdə 100 yaşını qeyd edən Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin ən böyük ali təhsil müəssisələrindən biridir. Universitet olaraq 100 illik ərəfəsində tədris, elmi tədqiqat işləri və beynəlxalq əməkdaşlığın genişləndirilməsi istiqamətində həm kəmiyyət, həm də keyfiyyət baxımından inkişafyönümlü layihələrin icrası xüsusi əhəmiyyət kəsb edir.

Aparılan məqsədyönlü fəaliyyət və 2018-2021-ci illəri əhatə edən Strateji İnkişaf Planı üzrə dəqiq icra olunan tədbirlər nəticəsində qısa zaman kəsiyində müsbət və innovativ yeniliklərə nail olunmuşdur. Bu strateji xətt növbəti yüzilliyə daxil olarkən də əzmlə davam etdiriləcək. İnkişaf yolunda irəliləyən qocaman ali təhsil müəssisəsinin bütün kollektivini, çoxminli tələbə kontingentini bu möhtəşəm bayram münasibətilə ürəkdən təbrik edirəm.



**Strateji inkişaf üzrə rektor müşaviri**
**Ümid Mehdiyev**



Əziz həmkarlar, tələbə və məzunlar! Hörmətli təhsil ictimaiyyəti! Fəaliyyəti dövründə minlərlə müəllimin, yüzlərlə tanınmış alim, ziyalı və görkəmli ictimai-siyasi xadimin yetişməsində, təhsilimizin inkişafında misilsiz xidmətlər göstərmiş Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 yaşı tamam olur. İlk ana dilli ali məktəb olan doğma universitetimiz bu gün də 100 yaşlı qocaman ali təhsil müəssisəsi olaraq dünya təhsilinə inteqrasiya etməklə şərəfli, əməksevər, qəhrəman, innovativ Azərbaycan müəllimini yetişdirir. Bu gün 100 yaşlı Universitetin 30 yaşlı övladı olan ADPU-nun Quba filialı da əsas inkişaf istiqamətini elm, təhsil, innovativlik, inteqrativlik və əməkdaşlıq prinsipləri üzərində qurur. Böyük ənənələrə sadiq olan ali təhsil müəssisəmiz ulu öndər Heydər Əliyevin azərbaycançılıq ideologiyasının tələbləri əsasında müasir düşüncəli, bacarıqlı və peşəkar kadrların hazırlanması yolunda gələcəyə yeni güc və təşəbbüslərlə addım atır.

Hörmətli rektorumuz professor Cəfər Cəfərov başda olmaqla, nəcib müəllimlik peşəsinin layiqli ordusunu hazırlayan doğma universitetimizin dəyərli kollektivini, tələbələri və məzunlarımızı 100 illik yubiley münasibətilə ADPU-nun Quba filialının adından bir daha təbrik edərək, fəaliyyətlərində uğurlar və başarılar arzulayıram. Bayramımız mübarək!

**Yusif Alıyev**
**ADPU-nun Quba filialının direktoru, dosent**



Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı Filialı adından Azərbaycanın kadr hazırlığı tarixində mühüm yer tutan Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi münasibətilə universitetin rektoru, professor Cəfər Cəfərov başda olmaqla bütün kollektivini təbrik edir, bundan sonrakı illərdə də uzunömürlü təhsil ocağına bol uğurlar arzu edirik. ADPU bu gün nəinki ölkədə, həmçinin bir çox xarici ölkələrdə də özünə nüfuz qazanmışdır. Bu baxımdan Universitetin çoxsaylı uğurları arasında beynəlxalq standartlara uyğun ikili diplom üzrə tədrisin həyata keçirilməsini qeyd edə bilərik. Ölkənin ictimai-siyasi həyatında da mühüm rol oynayan bu təhsil ocağı yetişdirdiyi müəllim kadrları vasitəsilə eyni zamanda Azərbaycanın gələcəyində bütün təhsil pillələri üzrə uşaq, yeniyetmə və gənclərimizin vətənə layiqli vətəndaş kimi yetişmələrində mühüm rol oynayır.

Qürurla deyə bilərik ki, 100 yaşlı çinarın 30 illik fidanı - ADPU-nun Şamaxı filialı da bu gün hörmətli rektorumuz professor Cəfər Cəfərovun rəhbərliyi və dəstəyi ilə uğurlara imza atır. Filialda 7 ixtisas üzrə (İbtidai sinif müəllimliyi, Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, Məktəbəqədər təhsil, Təhsildə sosial-psixoloji xidmət, Tarix və coğrafiya müəllimliyi, Riyaziyyat və informatika müəllimliyi, Fizika müəllimliyi) yüksək keyfiyyətli tədris mühiti və müasir tədris üsulları ilə kadr hazırlığı aparılır. Filialın cəmiyyətdə özünə müsbət imic qazanmasının əsas səbəblərindən biri də ADPU-nun ümdə prinsip kimi seçdiyi obyektivlik, şəffaflıq və humanizmdir.

**Tünzalə Yusifova**
**ADPU-nun Şamaxı filialının direktoru, dosent**



Azərbaycan elminə və təhsilinə sanballı töhfələr verən yüz yaşlı təhsil ocağı

Sevinirik ki, Azərbaycanın qocaman elm və təhsil məbədi olan ali təhsil ocağının bir parçası – Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialı olaraq təhsilimizin inkişafı naminə biz də səylə çalışır, yüksək ixtisaslı pedaqoji kadrların hazırlanması işində bu ali təhsil ocağının təcrübəsindən faydalanırıq.

Bu gün Azərbaycanda elə bir ailə yoxdur ki, bu ali təhsil ocağının ziyasından o ailəyə pay düşməsin. Ona görə də ADPU-nun yaradılmasının 100 illik yubileyi, əslində bütün Azərbaycan elminin, təhsilinin, bütövlükdə Azərbaycanın bayramıdır.

Hazırda 5 rayonda filialları, Bakıda 4 tədris binası, 1 kolleci fəaliyyət göstərən Universitetdə hər il 4 mindən çox yüksək ixtisaslı məzun təhsilini başa vurur. Yubiley münasibətilə ADPU-nun çoxsaylı kollektivini ürəkdən təbrik edir, peşəkar mütəxəssislərin hazırlanması istiqamətində yorulmaz fəaliyyətimizdə müvəffəqiyyətlər, Azərbaycan elminin və təhsilinin durmadan inkişafı yolunda uğurlar diləyirik.

**Rafiq Rasulov**
**ADPU-nun Şəki filialının direktoru, riyaziyyat üzrə elmlər doktoru,**

# PEDAQOJİ UNİVERSİTETİ GƏLƏCƏYƏ APARANLAR



Milli təhsilimizin əsasının qoyulmasında, inkişafında və elmi pedaqoji kadr hazırlığının həyata keçirilməsində Azərbaycan Dövlət Pedaqoji Universiteti müstəsna əhəmiyyət kəsb edir.

Bu gün Azərbaycan Dövlət Pedaqoji Universitetinin dünyagörüşlü, qlobal düşüncəli dövrün tələblərinə cavab verən nəzəri və praktiki biliklərə malik yetirmələri Respublikanın müxtəlif təhsil müəssisələrində uğurlu fəaliyyət göstərərək Azərbaycanda intellektual potensialın inkişafına öz töhfələrini verir.

Milli ziyalı ordusunu formalaşdıran, bir əsrlik şanlı yol keçmiş Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi münasibəti ilə ADPU Cəlilabad filialının rəhbərliyi və kollektivi adından bütün ADPU ailəsini təbrik edir, şərəfli missiyanın daha uğurla həyata keçirilməsi yolunda müvəffəqiyyət arzu edirik.

**Xudayar Sultanlı**
**ADPU-nun Cəlilabad filialının direktoru, dosent**



Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubiley tədbirlərinin keçirildiyi bu günlərdə Tədris departementi adından yubilyar ali məktəbimizin rəhbərliyini, şərəfli əməkləri, elmi-pedaqoji bilikləri və təcrübələri, ən əsası - yaradıcı düşüncələri ilə daim tələbələrimizin yanında olan professor-müəllim heyətini səmimi qəlbdən təbrik edirəm.

Gələcəyin müəllimlərinin ixtisas hazırlığında xüsusi zəhmət payı olan tədris-köməkçi heyətin hər bir üzvünün bəzən görünən, bəzən görünməyən cəfakeş fəaliyyətlərində onlara uğurlar diləyir və bütün ADPU əməkdaşlarına möhkəm cansağlığı arzulayıram.

100 yaşın mübarək, qocaman universitetimiz !

**Sənan Əliyev**
**Tədris departamentinin direktoru, dosent**



Ölkə Prezidenti, cənab İlham Əliyevin Sərəncamına əsasən Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi universitet ailəsinin üzvləri kimi bizi də sevindirir.

1921-ci ildən Azərbaycanda ilk ali pedaqoji təhsil ocağı kimi fəaliyyətə başlayan Azərbaycan Dövlət Pedaqoji Universiteti zəngin ənənələrə malik, Azərbaycan təhsil tarixində əhəmiyyətli mövqeyi olan ali təhsil müəssisəsidir. ADPU yarandığı gündən təhsil sahəsində götürdüyü öhdəlikləri daim şərəf və ləyaqətlə yerinə yetirmiş, müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə Azərbaycan təhsilinin inkişafına töhfələrini verməkdə davam edir.

Düşünürük ki, Respublika təhsil sisteminə minlərlə yüksək səviyyəli kadr potensialı, həmçinin digər ölkələr üçün elmi-pedaqoji kadr hazırlığı işini müvəffəqiyyətlə həyata keçirən, tanınmış ictimai, elm və mədəniyyət xadimləri yetişdirən Azərbaycan Dövlət Pedaqoji Universitetinin öz əməli işi ilə fəxr etməyə mənəvi haqqı var. ADPU-nun Ağcabədi filialı olaraq başda Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov olmaqla bütün universitet ailəsinə ali təhsil ocağımızın 100 illik yubileyi münasibətilə gözaydınlığı verir, bundan sonrakı fəaliyyətdə uğurlar və cansağlığı arzu edirik.

**Mobil Macidov**
**ADPU-nun Ağcabədi filialının direktoru, dosent**



100 illik şərəfli bir yol keçmiş Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizdə müəllim hazırlığı üzrə aparıcı təhsil müəssisəsidir. Bu universitetin məzunu olmaq və hazırda öz müəllimlərimlə bir kollektivdə şərəfli missiyanı həyata keçirməkdən qürur duyur, gələcəyin pedaqoqlarını yetişdirməyin necə əvəzedilməz hiss olduğunu anlayıram.

Keçmişə boylanarkən universitetin ilk günündən etibarən çalışmış müəllimləri ehtiramla yad edir, bu gün eyni izdən gedən kollektivi və tələbə heyətini ürəkdən təbrik edir, səmimi qəlbdən müvəffəqiyyətlər, gələcək fəaliyyətlərinizdə uğurlar arzu edirəm!

**İsrayıl İsgəndərov**
**Azərbaycan Dövlət Pedaqoji Universiteti nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru, dosent**



Azərbaycan pedaqoji tarixinin, elminin, təhsilinin əvəzsiz abidəsi olan Azərbaycan Dövlət Pedaqoji Universiteti bu il 100 illik yubileyini qeyd edir. ADPU fəaliyyətə başladığı gündən etibarən ölkəmizdə təhsilin, elmin inkişafına öz töhfələrini vermiş və bu gün də bu ənənəni layiqli şəkildə davam etdirməkdədir.

Hal-hazırda Universitetin Tarix və coğrafiya fakültəsində Tarix müəllimliyi, Coğrafiya müəllimliyi, Tarix və coğrafiya müəllimliyi və Sosial iş ixtisasları üzrə kadr hazırlığı həyata keçirilir. Fakültədə ixtisas hazırlığında peşəkar professor-müəllim heyətinin rolu əvəzedilməzdir.

Fakültə, milli pedaqoji kadrların hazırlanması, yeni elmi araşdırmaların aparılması, beynəlxalq təhsil müstəvisinə inteqrasiya, dövlətçilik ənənələrinin, milli-mənəvi dəyərlərin qorunub saxlanılması və gələcək nəsillərə ötürülməsində xüsusi rol oynamaqdadır. Bu şərəfli yolda gündən-günə gəncləşən fakültəmiz universitetimizin ali missiyasını qürur və ləyaqətlə yerinə yetirməkdədir.

100 il bundan öncə təməli qoyulan bu müqəddəs missiyanın nuru bu gün də gələcək nəsillərin yolunu işıqlandırır və işıqlandırmaqda davam edəcəkdir.

**Asif Axundov**
**Tarix və coğrafiya fakültəsinin dekanı v.i.e., dosent**



Əziz ADPU ailəsi!

Bu il doğma universitetimiz özünün şanlı tarixinin 100-cü ilini qeyd edir. ADPU yarandığı gündən bu günə qədər ölkəmizin pedaqoji kadr hazırlığı sahəsində aparıcı rol oynamışdır. Sevindirici haldır ki, ölkəmizin ali məktəbləri arasında özünəməxsus yeri və xidməti olan ADPU-nun Fizika fakültəsi də universitet fəaliyyətə başladıqda yaranan ilk fakültələrdən biri olmuşdur. Ötən 100 il ərzində fakültənin məzunları ölkəmizin elm və təhsil sahəsində bir çox uğurlara imza atmışdır. Fərəhləndirici haldır ki, fakültənin uğur dolu ənənəsi bu gün də yüksək səviyyədə davam edir. 100 illik yubileyini qeyd etdiyimiz universitetimizin zəngin ənənələrinin daha da inkişaf etdirilməsi, gənc müəllim kadrlarının hazırlanması yolunda çalışan hər kəsə uğurlar arzu edirəm.

100 illik yubileyimiz mübarək!

**Arzu Daşdəmirov**
**Fizika fakültəsinin dekanı, dosent**

# PEDAQOJİ UNİVERSİTETİ GƏLƏCƏYƏ APARANLAR

Dəyərli həmkarlar!

Sizi Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi münasibətilə səmimi qəlbdən təbrik edirəm!

Bir əsr ərzində ADPU böyük inkişaf yolu keçmişdir. Xüsusilə son illərdə universitetimizdə təhsil səviyyəsinin artması, idarəetmədə şəffaflıq və obyektivlik, yaranmış sağlam mühit göz önündədir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinə bundan sonra da təhsildə, cəmiyyətimiz üçün yüksək ixtisaslı kadrlar və vətəndaş yetişdirilməsi yolunda yeni uğurlar arzulayırıq.

**Araz Fərəcov**
**Riyaziyyat fakültəsinin dekanı, dosent**



Yarandığı ilk illərdən Azərbaycan Dövlət Pedaqoji Universitetin əsas məqsədi Azərbaycanda maarifçiliyin və elmin inkişaf etdirilməsi, ölkəyə ixtisasının haqqını verən vicdanlı, savadlı müəllimlərin yetişdirilməsi olmuşdur. Sonralar isə bütün fəaliyyəti dövründə universitet xalqın milli şüurunun, milli özünüdərkinin yetkinləşməsi, elm və təhsilin inkişafı və azərbaycançılıq ideologiyasının formalaşmasında əvəzsiz rol oynamışdır. Bu səbəbdən 100 il keçməsinə baxmayaraq ənənələr davam etdirilir, yüksək bilikli pedaqoji kadrlar yetişdirilir. Əminəm ki, daha bir 100 il keçdikdən sonra belə universitet yenə də ölkəmizin inkişafı üçün əzmlə fəaliyyət göstərəcək.

100 illik bayramın mübarək, milli sərvətimiz Pedaqoji Universitet!



**Elnarə Mehbalıyeva**
**Kimya və biologiya fakültəsinin dekanı, dosent**



Özünün köklü ənənələri ilə tanınan, Respublikanın təhsil tarixində önəmli yeri olan, qocaman təhsil ocağı Azərbaycan Dövlət Pedaqoji Universitetinin aparıcı fakültələrindən olan Məktəbəqədər təhsil fakültəsinin nəzdində üç: məktəbəqədər təhsil, təhsildə sosial-psixoloji xidmət və korreksiyaedici təlim ixtisasları fəaliyyət göstərir. Hər üç ixtisas bu gün nəinki Respublikamızda, eyni zamanda bütün dünyada çox tələb olunan peşələri öyrədən ixtisaslardır. Məktəbəqədər yaşlı uşaqların təhsili çağdaş dünyamızda ən önəmli məsələlərdəndir. Qloballaşan dünyada gedən proseslərin insanların psixikasına ciddi təsiri geniş tədqiqat sahəsidir. Dünyada gedən neqativ proseslərin: cəmiyyətdə, təbiətdə baş verən kataklizmlərin təsirindən meydana gələn problemlərin uşaqların sağlamlığına ciddi zərbə vurması göz qabağındadır. Korreksiyaedici təlim ixtisasına yiyələnən gənclərimiz bu sahədə peşəkarcasına çalışırlar.

Müstəqil Azərbaycanın gələcəyi naminə yüksək ixtisaslı pedaqoji kadrlar hazırlayan fədakar müəllimlərini, Respublikanın inkişafına böyük töhfələr vermiş və bu gün də öz fəaliyyətləri ilə örnək ola bilən Pedaqoji Universitet kollektivini və onun rəhbərliyini, gələcəyimiz olan tələbələri ADPU-nun 100 illik yubileyi münasibətilə təbrik edir, uğurlar arzulayıram.

Doğma evimizsən sən bizim, əziz universitet!

**Şəhla Əliyeva**
**Məktəbəqədər təhsil fakültəsinin dekanı, ped.ü.e.d.**



Azərbaycan Dövlət Pedaqoji Universitetinin yaranmasının 100 illiyini qeyd etdiyimiz bu günlərdə istər-istəməz keçilən yola nəzər yetirməli olursan. Bir əsrə bərabər olan bu yolda Universitetin qazandığı uğurlar, təbii ki, böyük fərəh doğurur. Bu illər ərzində Universitet böyümüş, inkişaf etmiş və ölkəmizin ali təhsil müəssisələri arasında yüksək nüfuza malik təhsil ocağı kimi tanınmışdır. Universitetimizin məzunları ölkəmizdə gənc nəslin təlim-tərbiyəsi və təhsili işinə böyük töhfələr vermişlər və bu gün müəllimlik missiyasını şərəflə yerinə yetirirlər. Bu missiya isə təkcə elm və təhsillə bitmir, həm də Vətənimizin sabahını etibar edəcəyimiz vətənpərvər gənclər yetişdirmək kimi müqəddəs vəzifəni ehtiva edir.

**Laçın Həsənova**
**İncəsənət və fiziki tərbiyə fakültəsinin dekanı, dosent**

Azərbaycan maarifçilərinin milli təəssübkeşliyi, əzmkarlığı və fədakarlığı sayəsində 100 il əvvəl yaradılan Azərbaycan Dövlət Pedaqoji Universiteti mürəkkəb və şərəfli yol keçmiş, milli düşüncənin inkişafına, elmi təfəkkürün və ziyalı təbəqəsinin formalaşmasına, elmi-pedaqoji kadr hazırlığına misilsiz töhfələr vermişdir. Bu tarix həm də qocaman təhsil ocağı ilə bağlı olan 160 mindən çox məzunun, yüzlərlə professor-müəllimin tarixidir. Universitetimizin məzunu görkəmli şair Mədinə Gülgün xatirələrinin birində yazırdı: "Azərbaycan Pedaqoji İnstitutu ana olub, mənə analıq şərəfi öyrətmiş, ata olub nəsihətləri ilə mənə nəsihət verməyi öyrədib, ev olub evimin sirlərini əziz tutubdur...".



Mədinə xanımın 50 il əvvəl söylədiyi fikirlərə qatılır və fəxr edirəm ki, həyatımın 40 ili bu müqəddəs elm və təhsil məbədi ilə bağlıdır. Burada tələbə, aspirant, elmi-tədqiqat laboratoriyasının müdiri, kafedra müdiri olmuşam, fakültə dekanıyam, görkəmli pedaqoq, psixoloq və metodistlərdən dərs almışam.

Həyatım boyu bu müqəddəs məkana, habelə mənə elm və helm öyrətmiş müdrik müəllimlərimə borcluyam.

Universitetimizin 100 illik bayramında müqqədəs elm və təhsil məbədini yaradanların, yaşadanların və sabaha aparanların işgüzarlığı, milli təəssübkeşliyi və fədakarlığına heyran qalmamaq olmur. Maarif məşəli yayan bu insanların ruhu qarşısında baş əyir, hər birini hörmət və ehtiramla yad edirəm.

# PEDAQOJİ UNİVERSİTETİ GƏLƏCƏYƏ APARANLAR



Bu günlərdə Azərbaycanda pedaqoji kadrların hazırlığı ilə məşğul olan ilk ali məktəbin – Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi tamam oldu. Bir əsrlik tarixində universitetimiz bir çox yeniliklərə imza atıb, bir çox ilklərin tətbiqində digər ali təhsil ocaqları arasında fərqlənə bilib.

100 yaşlı universitetimiz indi də əvvəlki gənclik şövqü ilə çalışmaqda, innovativ ideyalara meydan verməkdə, perspektivli layihələrə ev sahibliyi etməkdədir. ADPU-da 7 il ərzində fəaliyyət göstərən SABAH qruplarında yüzdən artıq SABAH məzununu yüksək akademik göstəricilərlə təhsilini başa vurub, uca müəllim adını qazanıb. İndi həmin məzunlarımız doğma Azərbaycanımızın müxtəlif bölgələrində savadlı, bilikli, bacarıqlı və hazırlıqlı şagirdləri yetişdirməkdədirlər.

İnanırıq ki, hələ yüzillər sonra da ADPU yeni-yeni innovativ layihələrə qatılaraq çağdaş tələblər və beynəlxalq standartlara cavab verən pedaqoji kadrlar yetişdirəcək, onun məzunu olan sayı yüzminlərlə ölçülən müəllim ordusu ölkədə təhsilimizin keşiyində duracaq, yeni nailiyyətləri ilə məzunu olduğu universitetin şöhrətinə şan qatacaq, SABAHımızı işıqlandırıcaqdır.

**Lalə Mürsəlbəyova**
**ADPU SABAH mərkəzinin rəhbəri**



Azərbaycan Dövlət Pedaqoji Universiteti şərəfli bir yol keçmişdir. Fəaliyyət göstərdiyi 100 il ərzində Azərbaycan maarifinin inkişafında, ümumtəhsil müəssisələri üçün ali təhsilli pedaqoji kadrların, eyni zamanda ali təhsil müəssisələri üçün yüksək ixtisaslı elmi-pedaqoji kadrların hazırlanmasında böyük xidmətlər göstərmişdir. Bu gün də ADPU üzərinə düşən vəzifənin öhdəsindən layiqincə gəlir.

**İbrahim Bayramov,**
**Magistratura və doktorantura şöbəsinin müdiri, filologiya elmləri doktoru, professor**



Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin yüksək səviyyədə qeyd edilməsi doğma ali təhsil ocağımızın və ölkəmizin həyatında çox əlamətdar hadisədir. Son illərdə müəllim peşəsinin nüfuzunun artırılması istiqamətində dövlət tərəfindən və universitet səviyyəsində aparılan islahatlar öz bəhrəsini verməkdədir.

İl ərzində yubileylə bağlı keçirilən bir sıra tədbirlərdə universitetimizin nüfuzu, nailiyyətləri haqqında təhsil ictimaiyyətinin, rəsmilərin, ali təhsil müəssisələrinin rəhbərlərinin, böyük ziyalıların müsbət fikirləri qürürvericidir.

Vətən müharibəsində müzəffər ordumuzun qəhrəmanlığı sayəsində əldə olunan tarixi qələbəmiz hər birimizin qarşısında pedaqoji sahənin gələcək inkişafı ilə bağlı yeni vəzifələr müəyyənləşdirir. İnanırıq ki, universitetimiz pedaqoji kadrların yenidənhazırlanması, təkmilləşdirilməsi, yeni ixtisaslara yiyələnməsi, özünüinkişafı, innovativ yeniliklərin tədqiqi və öyrədilməsi istiqamətində fəaliyyəti ilə öz töhfəsini verməkdə davam edəcək.

Yubiley münasibətilə universitet rəhbərliyi başda olmaqla, bütün həmkarlarımızı və əziz tələbələrimizi ürəkdən təbrik edirəm!

**Rəşad Sadıqov**
**Davamlı təhsil və innovasiyalar şöbəsinin müdiri,**
**siyasi elmlər üzrə fəlsəfə doktoru**



Əziz həmkarlar, dəyərli tələbələr və məzunlar!

Azərbaycan Dövlət Pedaqoji Universiteti özünün əsrlik fəaliyyəti dövründə ölkəmizdə elmin və təhsilin, tələbə-gənclərin qaynar ruhunun coşğun mərkəzlərindən biri olmuşdur. Bizləri birləşdirən bir dəyər halına gələn bu müqəddəs ocaqda təkcə gələcəyin müəllimləri deyil, eyni zamanda layiqli vətəndaşları, hərtərəfli inkişaf etmiş ziyalı şəxsiyyətləri tərbiyə olunur. Heç təsadüfi deyil ki, bu gün universitetimizin məzunlarının sorağı dünyanın müxtəlif guşələrindən gəlir. Ən əsası isə, böyük zəfərimizin mənəvi və fiziki memarları içərisində bu məbəddə təhsil almış Azərbaycan müəllimləri önəmli yer tutur.

Bu gün Universitetin bir əsrlik yubiley günündə hər bir müəllim və tələbəmizi, məzunlarımızı ürəkdən təbrik edərək dövlət və dövlətçiliyə şərəfli xidmət, bu böyük ailəyə daha böyük uğurlar, yeni nailiyyətlər arzu edirəm.

**Turan Kərimli**
**Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri**

Əziz ADPU ailəsi!

Məzunu olduğum Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixində ən şanlı, şərəfli və rəşadətli günlərindən biri – ADPU-nun 100 illik yubileyidir. Bu universitet Azərbycanda XXI əsrin tələblərinə cavab verən peşəkar, vətənpərvər və müəllim peşəsinin incəliklərini hiss edə bilən müəllimlərin hazırlanmasında həmişə öndə olmuşdur. ADPU-nun inkişafı yolunda həyata keçirilən, universitetin keyfiyyət siyasətinin düzgün aparılmasından qaynaqlanan məqsədyönlü fəaliyyətlərin nəticəsi olaraq universitetdə bir sıra keyfiyyət göstəriciləri yaxşılaşmışdır.

Universitetdə artıq tələbəyönümlü dərslərin təşkili, müəllim və tələbələr arasında səmimiyyət üzərində qurulan təlim-tədris prosesləri böyük sürətlə inkişaf etməkdədir. Bununla yanaşı, ADPU-nun dünyanın ən əzəmətli universitetlərindən biri olan Corc Vaşinqton Universiteti ilə ikili diploma bağlı əməkdaşlığı universitetimizdə aparılan işlərin ən yüksək səviyyədə olmasının bariz nümunələrindən biridir.



İnanıram ki, ADPU ailəsinin hər bir üzvü öz fədakar işgüzarlığı ilə ADPU-nun davamlı inkişafı uğrunda görüləcək hər bir işdə həmişə olduğu kimi öz əvəzsiz töhfəsini verəcəkdir. Hər birinizi 100 illik yubiley münasibətilə təbrik edirəm və sizlərə uzun ömür, sağlam həyat tərzi arzu edirəm.

**Qalib Şərifov**
**Keyfiyyətin Təminatı şöbəsinin müdiri, dosent**

# YETİRMƏLƏRİMİZ FƏXRİMİZDİR!

### GƏNC MƏZUNLAR PEDAQOJİ UNİVERSİTETİ TƏBRİK EDİR.

ADPU mənə tez bir zamanda ayaqlarım üstündə durmağı, müstəqil fikirləşməyi və gələcəyə dair vaxt itirmədən hərəkətə keçməyi öyrətdi. Buradan qazandığım dostluqlarım mənə hər zaman güc verirdi və hələ də verməyə davam edir, bunun üçün ayrıca ADPU-ya təşəkkür edirəm.

Buna bənzər dostluqların hər daim ADPU-nun divarlarında olmasını ümidi ilə, mənə həyat dərsi verən təhsil ocağımın 100 illiyini təbrik edirəm və daha çox potensiallı, istedadlı, həyatda tükənməz məqsədləri olan tələbələr arzulayıram.



**Səkinə Həsənova**
**Zhejiang Normal Universitetinin magistratura pilləsi üzrə məzunu, ADA məktəbinin kimya müəllimi**

Azərbaycan Dövlət Pedaqoji Universiteti mənim həyatımda silinməz izlər qoyub. Müstəqil həyata qədəm qoymağında və gələcək inkişafımda bu universitetlə çıxdığım yol mühüm rol oynayıb. Bu gün isə doğma təhsil ocağımızın 100 illik yubileyi qeyd olunur. Mən də universitetin gənc məzunlarından biri kimi Pedaqoji Universitetin rəhbərliyini, müəllimlər müəllimi olan müəllimlərini, bütün tələbə və məzunlarını ürəkdən təbrik edirəm.

Azərbaycan üçün daim yeniliklərlə irəli, möhtəşəm universitet!



**Günel Muradova**
**İngiltərənin Liverpul Universitetinin magistratura pilləsi üzrə məzunu, Azərbaycan Kapoeyra Federasiyasının Prezidenti**

Azərbaycan Dövlət Pedaqoji Universitetinin həyatini sahib olduğu 100 illik tarixi münasibəti ilə səmimi qəlbdən təbrik edirəm. ADPU-da təhsil almaq çox qürurvericidir. Bu gün qazandığım uğurlar üçün bütün müəllimlərimə və ADPU rəhbərliyinə təşəkkürlərimi bildirirəm.



**Rəşad Nəsibov**
**Azərbaycan Respublikası Təhsil Nazirliyində mütəxəssis**

Bu il zəngin ənənələrə malik, müasir dünyanın tələbinə uyğun olaraq hazırlıqlı, savadlı və vətənpərvər kadr hazırlayan qabaqcıl bir elm və təhsil müəssisəsi olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin fəaliyyətə başlamasının 100 illiyi tamam olur.

Daima görkəmli məzunları ilə fərqlənən Azərbaycan Dövlət Pedaqoji Universitetinin bundan sonra da ölkəmiz üçün yeni-yeni Mikayıl Müşfiqlər, Budaq Budaqovlar, Mehdi Hüseynzadələr yetişdirəcəyini əminliklə söyləyərək özümün də məzunu olduğum universitetin rəhbərliyini, müəllimlər müəllimi olan müəllimlərini, bütün tələbə və məzunlarını yubiley münasibəti ilə ürəkdən təbrik edirəm.

ADPU bütün məzunların qəlbində daima bir dəyər olaraq qalacaq.



**Sahil Qələndərov**
**Çinin Şansi Normal Universitetinin doktorantı, Bakı Slavyan Universitetinin rektorunun müşaviri**

Ölkəmin ilk ali pedaqoji təhsil ocağı, gənclik illərimizin ən dəyərli xatirəsi, minlərlə gəncin formalaşmasında yoluna işıq olan, bizə öyrətməyi öyrədən, qocaman, doğma universitetim, 100 yaşın mübarək!

Qürurvericidir ki, Azərbaycanın tanınmış, ictimai, elm və mədəniyyət xadimlərinin məzun olduğu təhsil ocağının bir parçası olmuşam.



**Nigar Xıdırova**
**Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi Aqrar İnnovasiya Mərkəzinin baş mütəxəssisi**

ADPU sadəcə bir sahədə deyil, hər sahədə müəllimliyi öyrədir insana. Peşəmizdən asılı olmayaraq hər birimiz ixtisasımızı müəllimdən öyrənmişik. Bütün sahələrin başında, hər birimizi yetişdirən müəllimlər durur. Buna görə də Pedaqoji Universitetin rolu əvəzsizdir.



**Cəmilə Hacıyeva**
**"Azad Azərbaycan Müstəqil Teleradio Kompaniyası"nın əməkdaşı, müxbir-jurnalist**

# YETİRMƏLƏRİMİZ FƏXRİMİZDİR!

## GƏNC MƏZUNLAR PEDAQOJİ UNİVERSİTETİ TƏBRİK EDİR.

Əziz və hörmətli professor-müəllim və tələbə kollektivi!

Sizi Azərbaycan Dövlət Pedaqoji Universitetinin yaranmasının 100 illik yubileyi münasibətilə səmimi qəlbən təbrik edir, sizə elmi və pedaqoji fəaliyyətlərinizdə yeni-yeni uğurlar arzu edirəm.

Ulu öndər Heydər Əliyev "Müəllim adı ən yüksək addır. Mən yer üzündə müəllimdən yüksək ad tanımıram!" demişdir. Müəllimlik peşəsi ən hörmətli, şərəfli və məsuliyyətli peşələrdən biridir. Cəmiyyətin tərəqqisi məktəbdən, məktəbin dəyəri isə keyfiyyətli və səriştəli kadr potensialından, ilk növbədə, müəllimdən asılıdır.

Bir əsrlik tarixə malik olan ölkəmizin ən nüfuzlu və sayılıb-seçilən ali təhsil ocaqlarından olan Pedaqoji Universitet bu günə kimi saysız-hesabsız professorlar, dosentlər, elmlər namizədləri, akademiyanın müxbir üzvləri və elm xadimləri hazırlayıb. Ali təhsil ocağı fəaliyyətinin bütün zamanlarında cəmiyyətdə milli mədəniyyətin, elm və təhsilin inkişafında xüsusi xidmətləri olan müəllim kadrları yetişdirməklə millətin mənəvi potensialının formalaşmasında önəmli rol oynayıb.

Başda universitetin rektoru, tarix elmləri doktoru, professor Cəfər Cəfərov olmaqla, bütün professor-müəllim heyətini bir daha bu tarixi gün münasibətilə könüldən təbrik edir, çətin və şərəfli işlərində yeni-yeni nailiyyətlər arzu edirəm. Universitetin şanlı tarixi zəfərimizlə başa çatan İkinci Qarabağ müharibəsində şəhidlik zirvəsinə ucalan məzunlarına Allahdan rəhmət, qazilərinə şəfa, yaxınlarına səbr diləyirəm.



**Mahmud Möhbalıyev**
**Müdafiə Nazirliyinin zabiti, baş leytenant**

Azərbaycan Dövlət Pedaqoji Universitetinin heyətini 100 illik qocaman tarixi münasibəti ilə ürəkdən təbrik edirəm. Təhsilimin müəyyən hissəsinin məhz ADPU-da keçməyi qürurvericidir. Gələcəyin gəncləri müəllimlərin əməyidir. Bu gün qazandığım uğurlar üçün bütün müəllimlərimə təşəkkürlərimi bildirirəm.



**Günay Quluzadə**
**Azərbaycan Respublikasının Səhiyyə Nazirliyinin Media və kommunikasiya şöbəsinin aparıcı mütəxəssisi, nazirliyin Covid-19-la mübarizə işçi qrupunun üzvü**

Azərbaycan Dövlət Pedaqoji Universiteti mənim təhsil həyatımda böyük, dəyərli izlər qoymuşdur. Tam sərbəst şəkildə həyata addımlamağımda bu universitetin böyük rolu var. Bu gün isə həqiqətən səbirsizliklə gözlənilirdi. Universitetimiz 100 illik yubileyini qeyd edir. Mən də bu universitetin gənc məzunlarından biri kimi Pedaqoji Universitetin rəhbərliyini, dəyərli müəllimlərimi, bütün tələbə və məzunları səmimi qəlbdən təbrik edirəm.




Azərbaycan təhsili üçün daim irəli, daim zirvədə, Azərbaycan Dövlət Pedaqoji Universiteti!

**Səbinə Nəbiyeva**
**2021-ci ildə MİQ imtahanlarında ibtidai sinif müəllimliyi ixtisası üzrə respublika birincisi**

Fəaliyyət göstərdiyi bir əsrlik tarixi dövr ərzində respublikamızın təhsil sahəsini peşəkar pedaqoji kadrlarla təmin etmək kimi şərəfli missiyanı uğurla yerinə yetirən, doğma Azərbaycan Dövlət Pedaqoji Universiteti! Zəngin ənənələrə sahib olan bu təhsil müəssisəsinin tarixinə nəzər saldıqda zamanın böyük çətinliklərindən keçdiyini, yüzlərlə fədakar alimlərin sayəsində daima öz nüfuzunu qoruyub saxladığının şahidi oluruq. "Müəllim" kimi müqəddəs bir peşə sahiblərinin əbədi məbədi hesab olunan ADPU bu il 100 illik yubileyini qeyd edir. Universitetin məzunu olaraq əminəm ki, geridə qoyduğu 100 illik ərzində olduğu kimi bundan sonrakı 100 illiklərdə də doğma universitetim üzərinə düşən tarixi missiyanı şərəflə yerinə yetirəcək. Müstəqil Azərbaycan dövlətinin gələcəyini inşa edəcək, xalqımıza və dövlətimizə sədaqətli, peşəkar təhsil işçiləri yetişdirəcəkdir!




**Ülvi Şamilov**
**İsmayıllı şəhər 4 nömrəli tam orta məktəbin tarix müəllimi**

# PEDAQOJİ UNİVERSİTETİN HİMNLƏRİ

Ali Pedaqoji Kişi İnstitutunun (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti) ilk himninin sözləri Abdulla Şaiqə, musiqisi isə Üzeyir Hacıbəyliyə məxsusdur.

A.Şaiq "Gənclik marşı" adlanan bu şeirini 1921-ci ildə yazıb və Ali Pedaqoji İnstitutun tələbələrinə həsr edib.







İllər sonra ADPU-nun indiki himnini isə məşhur şair, ADPU-nun müəllimi Oqtay Rza yazıb. Bu himnə universitetin məzunu və müəllimi olmuş bəstəkar, əməkdar incəsənət xadimi Elnarə Dadaşova musiqi məstələyib.

# ŞANLI 100 İLLİKDƏN












Azərbaycan SSR KP Mərkəzi Komitəsinin birinci katibi Heydər Əliyev Azərbaycan Dövlət Pedaqoji Universitetinin (o zamankı V.İ.Lenin adına ADPİ) 60 illik yubileyində Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanını kollektivə təqdim edir. Ümummilli lider təntənəli yubiley tədbirində çıxışı zamanı universitetin müəllimlərinin əməyini yüksək qiymətləndirərək demişdi: ***"Müəllimlik işi həm şərəfli, həm də çətin işdir. Ali məktəb müəllimi olmaq, müəllimlər hazırlamaq, yəni müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda ikiqat məsuliyyətli işdir".***

*23 dekabr 1981-ci il*





Azərbaycan SSR KP Mərkəzi Komitəsinin birinci katibi Heydər Əliyev Azərbaycan Dövlət Pedaqoji Universitetində (o zamankı V.İ.Lenin adına ADPİ) qəbul imtahanları ilə tanış olur.

*01 avqust 1982-ci il*

# PEDAQOJİ UNİVERSİTETİN QƏHRƏMANLARI

Əziz oxucu!

*Vətənimiz Azərbaycanın azadlığı və ərazi bütövlüyü uğrunda tarixin bütün dövrlərində mənfur düşmənlərlə mübarizə aparan xalqımızın igid oğul və qızları içərisində bir əsrlik zəngin tarixi irsi olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin yüzlərlə tələbə, məzun, əməkdaş və rəhbərləri də yer alır. Onların arasında onlarla şəhid, qazi və sərkərdələr var.*

*Diqqətinizə çatdırırıq ki, aşağıdakı siyahıda müxtəlif dövrlərdə ADPU-nun, onun filialları və tərkibindəki Pedaqoji Kollecin tələbə və məzunları olmuş qəhrəmanların bir qismi haqqında məlumat təqdim edilir. Onlardan 12 nəfəri İkinci Dünya müharibəsi iştirakçısı (4 nəfəri Sovet İttifaqı Qəhrəmanı, 8 nəfəri ADPU-nun rektoru (onların 5-i həm də ADPU-nun məzunudur)), 3 nəfəri Azərbaycanın Milli Qəhrəmanı, 1 nəfəri "Zəfər" Ordeni ilə, 2 nəfəri "Azərbaycan Bayrağı" Ordeni ilə təltif edilmiş, 29 nəfəri (onlardan 7 nəfəri ADPK-nın tələbə və məzunlarıdır) Birinci Qarabağ müharibəsi şəhidi, 12 nəfəri (onlardan 2 nəfəri Şamaxı Filialının, 1 nəfəri Ağcabədi Filialının, 3 nəfəri ADPK-nın tələbə və məzunlarıdır) Vətən müharibəsi şəhidi, 45 nəfəri Birinci Qarabağ müharibəsi iştirakçısı, 10 nəfəri Aprel döyüşləri iştirakçısı (onlardan 8 nəfəri həmçinin Vətən müharibəsi iştirakçısıdır) və 178 nəfəri isə Vətən müharibəsi iştirakçısıdır. Ümumilikdə 236 nəfərin yer aldığı bu cərgə Azərbaycan xalqının şanlı qəhrəmanlıq tarixinin ayrılmaz parçasıdır.*

*Təqdim olunan adlı siyahı Universitetin 100 illiyinə həsr olunmuş işlər çərçivəsində hazırlanan "Pedaqoji Universitetin Qəhrəmanları" ensiklopedik toplusunun materialları əsasında tərtib edilib. Qeyd edək ki, siyahı yekun və müfəssəl olmayıb, bu sahədə aparılan ilk tədqiqatın nəticəsidir. Bu, gələcək tədqiqatlarda qəhrəmanlarımız haqqında daha da müfəssəl məlumatların əldə edilməsi üçün ilk siqnaldır.*

*Burada isə, ilkin olaraq yüksək təltiflərə layiq görülənlər, Birinci Qarabağ və Vətən müharibələrinin şəhidlərinin siyahısı yer alır.*

### II DÜNYA MÜHARİBƏSİ İŞTİRAKÇILARI. SOVET İTTİFAQI QƏHRƏMANLARI

1. Hüseynzadə Mehdi Hənifə oğlu (leytenant) – ölümündən sonra
2. Kazımov Səlahəddin Həsən oğlu (general-mayor)
3. Mustafayev Xıdır Həsən oğlu (mayor)
4. Səfərov Fariz Məcid oğlu (mayor)

### AZƏRBAYCANIN MİLLİ QƏHRƏMANLARI

1. İbrahimov Mirələkbər Mirələsgər oğlu (kapitan) – ölümündən sonra
2. Quliyev Mətləb Kamran oğlu (leytenant) – ölümündən sonra
3. Salahov Şakir Şamil oğlu – ölümündən sonra



### "ZƏFƏR" ORDENİ İLƏ TƏLTİF EDİLƏNLƏR

Nağıyev Əli Nağı oğlu (general-polkovnik)

### "AZƏRBAYCAN BAYRAĞI" ORDENİ İLƏ TƏLTİF EDİLƏNLƏR

1. Bayramov Malik Yaşa oğlu (baş leytenant) – ölümündən sonra
2. Nağıyev Əli Nağı oğlu (general-polkovnik)

### I QARABAĞ MÜHARİBƏSİ ŞƏHİDLƏRİ

1. Abbasov S.S.
2. Abdullayev N.V.
3. Allahyarov İ.N.
4. Baxışov Rəşid Hacıağa oğlu
5. Balakişiyev Müşfiq
6. Bünyadov V.F.
7. Cəfərov Firuzəddin Tapdıq oğlu
8. Ələkbərov Hilal Hilal oğlu
9. Əsədov İ.M.
10. Hüseynov Ehtiram Aydın oğlu
11. İsmayılov İ.D.
12. İsmayılov V.M.
13. Kərimov M.
14. Qasımov N.T.
15. Qədirov E.A.
16. Qəhrəmanov Elman İxtiyar oğlu
17. Məmmədov Mürşüd Ağa oğlu (mayor)
18. Məmmədov Tağı
19. Nurullayev Qismət
20. Rəhimov İntizam Əhməd oğlu (baş leytenant)
21. Rzayev A.M.
22. Salıfov İ.N.
23. Səfərov İdris
24. Şahverdiyev Əlövsət Kərim oğlu
25. Zülfiyev Hicran Əliş oğlu (leytenant)

### VƏTƏN MÜHARİBƏSİ ŞƏHİDLƏRİ

1. Abbasov Ağaqardaş İlham oğlu (baş leytenant)
2. Ağaquliyev İlkin Saməddin oğlu (MAHHXQ)
3. Baxışova Arəstə Kərim qızı (çavuş)
4. Əzizov Elgün Elman oğlu (baş leytenant)
5. Hüseynli Etiram Həsən oğlu (leytenant)
6. Lətifov Rəvan Ömür oğlu
7. Nəbiyev Cilingir Azad oğlu (gizir)
8. Nəbiyev Orxan Rza oğlu (leytenant)
9. Nüsrətli Ceyhun Aqil oğlu
10. Ömərov Qoşqar Səxavət oğlu
11. Tahirov Firdovsi Balaxan oğlu
12. Zakirov Elvin Ağasəlim oğlu (baş leytenant)

**Taleh Mirzəyev**

# NƏ ÜÇÜN ADPU?

- Çoxillik təcrübə əsasında formalaşdırılmış tədris və təlim ənənələri;
- İnnovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsinin təmin edilməsi;
- Təhsil müddətində tədris prosesinə dəstək və çoxsaylı xidmətlər,
- ABŞ-ın tanınmış Corc Vaşinqton Universiteti ilə imzalanan beynəlxalq ikili Diplom Proqramı üzrə sazişə əsasən magistratura səviyyəsində Təhsil ixtisası üzrə tam ödənişsiz ikili diplom almaq şansı;
- Danimarkanın Kopenhagen Universitet Kolleci (UCC) ilə Erasmus+ çərçivəsində imzalanmış "Fəaliyyət 1 – tələbə və heyət mobilliyi" müəssisələrarası müqaviləsindən, həmçinin Mövlana Mübadilə Proqramından yararlanaraq tərəfdaş universitetlərdə mübadilə imkanları;
- Tədqiqat imkanlarından istifadə edərək ixtisaslar üzrə təkmilləşmək;
- SABAH qruplarında yüksək praktik təhsil almaq imkanı;
- Azərbaycan, rus və ingilis bölmələri üzrə ali pedaqoji təhsil almaq imkanları;
- Ümumtəhsil məktəbləri, məktəbəqədər təhsil müəssisələri, elmi tədqiqat institutlarında pedaqoji təcrübə keçməklə əmək vərdişləri və təcrübə qazanmaq;
- Beynəlxalq tələbə mühiti;
- İkitərəfli əməkdaşlıqlar və layihələr çərçivəsində dəvət edilmiş xarici müəllimlərin mühazirə imkanlarından faydalanmaq;
- Əcnəbi tələbələrə dəstək;
- Beynəlxalq, regional konfranslardan, həmçinin təlim və seminarlardan yararlanmaq;
- Tələbə təşkilatlarının işində və təşkil etdiyi müxtəlif tədbirlərdə iştirak;
- ADPU-nun Ağcabədi, Quba, Şamaxı, Cəlilabad və Şəki filiallarında bakalavriat pilləsində təhsil imkanları.

## ADPU RƏQƏMLƏRDƏ

18000 nəfərdən çox təhsilalan;
4000 nəfərə yaxın subbakalavr;
13000 nəfərə yaxın bakalavr;
650 nəfərədək magistr;
100 nəfərədək doktorant;
650 nəfərədək əlavə təhsil alan;
2200 nəfərdən çox təhsilverən heyət;
1600 nəfərə yaxın akademik heyət;
650 nəfərdən çox inzibati heyət;
60-dan çox professor;
70-dək elmlər doktoru;
300-ə yaxın dosent;
350-dən çox fəlsəfə doktoru.



Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

# Əsrin yükünü çiynində daşıyanlar Pedaqoji Universitetin rektorları

Mənbə: Rüstəmov F.A. Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları. Bakı, "Elm və təhsil", 2019, 304 səh.









Professor Cəfər Cəfərov
Müşahidə şurasının sədri

Dosent Eldar Aslanov
Müşahidə şurasının üzvü

Professor Asəf Zamanov
Müşahidə Şurasının üzvü

Professor Fikrət Rzayev
Müşahidə Şurasının üzvü

Professor Mahirə Hüseynova
Müşahidə Şurasının üzvü

Könül Pirverdiyeva
Müşahidə Şurasının üzvü

Tural Cəlilov
Müşahidə Şurasının üzvü

Cavid Hüseynov
Redaktor

Taleh Mirzəyev
Redaktor

Asim İbrahimov
Redaktor

Elvin Vahidov
Dizayner

Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 2609

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.